

AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ YANINDA
ALİ ATTESTASİYA KOMİSSİYASI


















https://doi.org/10.69682/arti.2024.91.4
https://zenodo.org/record/7714846#.ZCqgSnZBzIV – Zenodo
https://archive.org/details/20230309_20230309_1112 – Internet Archive
https://journals.indexcopernicus.com/search/details?id=122986 – Index Copernicus
https://journalseeker.researchbib.com/view/issn/2409-8817 – Researchbib
https://www.slideshare.net/Humeyir/scientific-works-257022296?from_search=0 – SlideShare
https://www.calameo.com/books/0073359955276c2cd4d80 – Calameo
https://isindexing.com/isi/viewjournal.php – International Scientific Indexing
http://olddrji.lbp.world/Search.aspx?J=Scientific%20Works&S=0 – Directory of Research Journals Indexing

**ISSN 2409-8817**

**AZƏRBAYCAN RESPUBLİKASININ ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*

**cild 91, № 4, 2024**

# *НАУЧНЫЕ ТРУДЫ*

**том 91, № 4, 2024**

# *SCIENTIFIC WORKS*

**volume 91, № 4, 2024**

**“Elmi əsərlər” 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**
**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06

***Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi şurasının 03 may 2024-cü il tarixli iclasının qərarı ilə nəşr edilir.***

***Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu***
***“Elmi əsərlər” məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin 11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.***

*Published by the decision of the Academic Council of the Institute of Education of the Republic of Azerbaijan*

*Founder: Institute of Education of the Republic of Azerbaijan*
*The collection "Research Papers" was registered by order No. 23 of July 11, 2002 of Ministry of Justice of the Republic of Azerbaijan*

*"Research Papers" has been published since 1934.*

*Frequency of publication: 6 issues per year. "Research Papers" are included in the list of publications recommended by the decision of the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan*





## *BAŞ REDAKTORDAN*
## *ОТ ГЛАВНОГО РЕДАКТОРА*
## *FROM THE EDITOR-IN-CHIEF*



UOT 371

***Akif Nurağa oğlu Abbasov***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9210-7141*
https://doi.org/10.69682/arti.2024.91(4).5-9

## MOLLA PƏNAH VAQİF HƏQİQƏTİ: ŞAGİRDLƏR VƏ TƏLƏBƏLƏRLƏ SÖHBƏT

***Акиф Нурага оглы Аббасов***
*ученый секретарь Института Образования Азербайджанской Республики,*
*доктор педагогических наук, профессор, заслуженный учитель*

## ПРАВДА О МОЛЛА ПАНАХА ВАГИФА: РАЗГОВОР С УЧАЩИМИСЯ И СТУДЕНТАМИ

***Akif Nuragha Abbasov***
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan,*
*doctor of pedagogical sciences, professor, Honored teacher*

## THE TRUTH ABOUT MOLLA PANAH VAGIF: CONVERSATION WITH PUPILS AND STUDENTS

**Xülasə.** Məqalədə Vaqif Poeziya Günlərindən danışılır. Erməni işğalından əvvəl və hazırda Şuşada Vaqif Poeziya Günləri keçirilir. Dövlət xadimləri, görkəmli yazıçı və şairlər, mədəniyyət və incəsənət nümayəndələri, xarici qonaqlar bu mərasimin iştirakçıları olur, çıxışlar edirlər. Məqalədə, eyni zamanda Vaqifin həyat və fəaliyyəti yada salınır, qarşılaşdığı çətinliklər, ağrılı anlar barədə məlumat verilir.
***Açar sözlər**: poeziya günləri, Vaqif Poeziya Günləri, Şuşa – mədəniyyət paytaxtımız, görkəmli şair, dövlət xadimi, diplomat, baş vəzir*

**Аннотация**. В статье говорится о Днях поэзии Вагифа. До армянской оккупации и сейчас в Шуше проводятся Дни поэзии Вагифа. В церемонии участвуют и произносят речи государственные чиновники, видные писатели и поэты, представители культуры и искусства, зарубежные гости. В статье одновременно вспоминается жизнь и деятельность Вагифа, сообщается о трудностях и болезненных моментах, с которыми он столкнулся.
***Ключевые слова**: дни поэзии, Дни поэзии Вагифа, Шуша – наша культурная столица, выдающийся поэт, государственный деятель, дипломат, премьер-министр*
**Abstract.** The article talks about Vagif's Poetry Days. Before the Armenian occupation and now, Vagif's Poetry Days are held in Shusha. Government officials, prominent writers and poets, representatives of culture and art, and foreign guests participate and give speeches in the ceremony. The article simultaneously recalls Vagif's life and work, and reports on the difficulties and painful moments he faced.
***Keywords:** poetry days, Vagif poetry days, Shusha is our cultural capital, an outstanding poet, statesman, diplomat, prime minister.*

Vaqif Poeziya Günləri. Şuşa şəhəri ermənilər tərəfindən işğal edilən günə qədər hər il burada təntənəli şəkildə Vaqif Poeziya Günləri keçirilirdi. Erməni faşistləri Şuşada dolaşdıqları

illərdə Vaqifin məqbərəsini dağıtmış, Üzeyir Hacıbəylinin, Natəvanın və Bülbülün büstlərini gülləbaran etmişdilər. Uzun illər fasilə oldu.

Nəhayət, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Silahlı Qüvvələrimiz Şuşanı işğaldan azad etdi.

Düşmən üzərində Zəfər çaldıqdan sonra az sonra Heydər Əliyev Fondunun təşəbbüsü ilə Şuşada yenidən Vaqif Poeziya Günləri təşkil olundu. Prezident cənab İlham Əliyev və birinci vitse-prezident Mehriban xanım Əliyeva Vaqif Poeziya Günlərinin rəsmi açılışında iştirak etdilər. Respublika Prezidenti İlham Əliyev mərasimdə çıxış edərək dedi: "Əziz dostlar, bu gün ölkəmizin həyatında çox əlamətdar bir gündür. Biz böyük Azərbaycan şairi, dövlət xadimi, Qarabağ xanının vəziri Molla Pənah Vaqifin məqbərəsinin önündə Vaqif Poeziya Günlərinin açılışını qeyd edirik. Bu münasibətlə sizi və bütün Azərbaycan xalqını ürəkdən təbrik edirəm. Vaqifin məqbərəsi bütün digər tarixi abidələrimiz kimi işğal edilmiş torpaqlarda erməni vandalizminə məruz qalmışdır. Bu gün isə məqbərə tam bərpa edilib və dünən məqbərənin ikinci açılışı olmuşdur. Bildiyiniz kimi, Molla Pənah Vaqifin məqbərəsinin Şuşada ucaldılması qərarını ulu öndər Heydər Əliyev vermişdir. Onun təşəbbüsü ilə 1982-ci il yanvarın 14-də burada qarlı, şaxtalı havada bu məqbərənin açılışı olmuşdur. Ulu Öndərin iradəsi və qətiyyəti nəticəsində bu məqbərə ucaldılmışdır və bir daha Şuşanın Azərbaycan şəhəri kimi təsdiqi öz yerini tapmışdır" [1].

Yenə də hər il Mədəniyyət paytaxtımız olan Şuşada Vaqif Poeziya Günləri keçirilməkdədir. Bu il iyulun 18-də də dövlət və hökumət nümayəndələri, poeziya sevərlər, ölkəmizin məşhur ədəbiyyat, elm və mədəniyyət xadimləri, həmçinin doğma şəhərə köçmüş Şuşa sakinləri bu təntənəli mərasim münasibətilə Molla Pənah Vaqifin muzey-məqbərə kompleksinin qarşısında toplaşmışdılar.

**Molla Pənah Vaqif kimdir?** Vaqif məşhur Azərbaycan şairidir. Vaqifin şeirləri – qoşmaları, təcnisləri, qəzəlləri, müxəmməsləri, müstəzadları, müəşşərləri zamanında da, hazırda da sevilə-sevilə oxunur və dillər əzbəridir. Vaqif yazırdı:

Kür qırağının əcəb seyrəngahı var,
Yaşılbaş sonası, hayıf ki, yoxdur!
Ucu tər cığalı siyah tellərin
Hərdən tamaşası, hayıf ki, yoxdur!
Qış günü qışlağı Qıraqbasanın,
Gözüdür Aranın, cümlə-cahanın,
Belə gözəl yerin, gözəl məkanın
Bir gözəl obası, hayıf ki, yoxdur!
Çoxdur ağ bədənli, büllur buxaqlı,
Lalə zənəxdanlı, qönçə dodaqlı.
Amma şirin dilli, açıq qabaqlı,
Könül aşinası, hayıf ki, yoxdur!
Ucu əşrəfili, bulut kimi saç,
Dal gərdəndə hər hörüyü bir qulac,
Kələğayı əlvan, qəsabə qıyğac,
Altından cunası, hayıf ki, yoxdur!
Vaqif haqdan dilər lütfü kərəmlər,
Belə yerdə qalan, vallah, vərəmlər.
Yenə yada düşdü bizim sənəmlər.
Getməyin binası, hayıf ki, yoxdur!
[2, s. 114].

Vaqif məktəbdar olduğu üçün camaat onu "Molla" deyə adlandırırdı. Bu, şairin savadlı və son dərəcə ziyalı, oturuşunu-duruşunu bilən, şəxsiyyətlərarası münasibətləri gözləyən bir şəxs olması, yüksək təhsil alması, ərəb və fars dillərinə yiyələnməsi, müdrik və uzaqgörən bir siyasətçi olması, bəzi dini və dünyəvi elmlərə bələdliyi ilə bağlı idi. 42 yaşına kimi anadan olduğu Qazaxda yaşamışdı. Vaqif Mehdi ağanın oğlu idi. 1759-cu il idi. Qazax kəndlərinin sakinləri Qarabağ xanlığına köçmək məcburiyyətində qalmışdılar. Nə üçün? Qazax mahalında və Gürcüstan sərhədlərində tez-tez feodal münaqişələri baş qaldırır, yaşayış çətinləşirdi. Ayaq altında qalmaq olardı. Vaqifin ailəsi yaranmış vəziyyəti nəzərə alaraq, Cavanşir mahalının Tərtərbasar kəndinə köçdülər. Vaqif burada təhsilini davam etdirdi. Daha sonra özü məktəb açdı. Bir müddət keçdi. Vaqif Qarabağ xanlığının mərkəzi Şuşa şəhərinə gedərək Saatlı məhəlləsində məktəb yaratdı. "*Molla Pənah Vaqif ədəbi dilin zənginləşdirilməsində yaddaqalan addımlar atmışdır. O, bir şair kimi xalqın ruhuna güc verir, bir siyasətçi kimi isə xalqın idarə işlərini aparırdı*" (Mirzə Adıgözəl bəy).

Molla Pənah görkəmli siyasi və ictimai xadim, Qarabağın sonuncu hökmdarı İbrahimxəlil xanın sarayında baş vəzir (daxili işlər naziri) idi. Əvvəllər isə, eşikağası, xarici işlər naziri olmuşdu. O eyni zamanda Qarabağ türklərinin (azərbaycanlıların) mənəvi dayağı və rəhbəri sayılırdı.

Vaqif İbrahimxəlil xanın və onun övladlarının şəxsi binalarının, hərəmxanalarının, xan sarayının və Şuşa divarlarının tikintisinə nəzarət və rəhbərlik edirdi.

Baş vəzir olduğu vaxtlarda İbrahimxəlil xanın məsləhəti ilə Rusiya ilə diplomatik əlaqələr saxlayırdı. Rusiyaya gedib-gəldiyi də olurdu.

1783-cü ilin martın 18-də İbrahimxəlil xan II Yekaterinaya məktub göndərərək onun Rusiyanın himayəsinə qəbul olunmasını xahiş etdi. II Yekaterina Q.A. Petyomkinə bildirdi ki, İbrahimxəlil xan xərac ödəyəcəyi təqdirdə onun hakimiyyətdə saxlanacaq və hətta Rusiyanın himayəsi altına qəbul edilə biləcək [3].

Çar II Yekaterina ona daş-qaşla bəzədilmiş əsa da bağışlamışdı.

"*Vaqif ağıllı və təcrübəli vəzir kimi böyük şöhrət və xalqın rəğbətini qazanmışdır (Mirzə Camal Cavanşir Qarabaği).*

Akad. N. Cəfərov yazır: "M.P. Vaqifin Rusiyaya "meyli" bütün hallarda diplomatik xarakter daşımaqla, həmişə Qarabağ xalqının (və müəyyən mənada Azərbaycanın) müstəqilliyini qorumağa xidmət etmişdir" [4].

**Molla Pənah Vaqifin faciəli şəkildə öldürülməsi**. Ağa Məhəmməd şah Qacar bir neçə dəfə Şuşaya qoşun çəkmişdi. Bəzi mənbələrdə göstərildiyinin əksi olaraq, əslində şahın məqsədi Şuşanı tutmaq olmayıb. Qarabağ xanlığının Rusiyaya meyilliliyi, Rusiyanın himayəsinə keçmək niyyəti onu hiddətləndirmişdi. Səbəbkarları cəzalandırmaq, Qarabağa yiyə durmaq, Rusiyanın gözünü bu torpaqlardan çəkməsini istəyirdi.

Ağa Məhəmməd şah Qacar 1797-ci ilin baharında ordunun başında Qarabağa doğru hərəkət etdi. Yaranmış vəziyyətdən ehtiyatlanan İbrahimxəlil xan bir qisim tərəfdarlarının müşayiəti ilə Qarabağı tərk etdi.

Şuşaya daxil olan Qacar onun yaxın adamlarını, o cümlədən Molla Pənah Vaqifi və oğlunu həbsə alır. Lakin Ağa Məhəmməd xan gecə ikən yatağında öz adamları - Abbas bəy və Səfaralı tərəfindən qətlə yetirilir. Bunu görən Qacar ordusu geriyə - İrana yola düşür. Qarabağ xanlığının taxtında Məhəmməd bəy Cavanşir əyləşir. O, zindana salınanları, o cümlədən Vaqifi və onun oğlunu həbsdən azad edir. Lakin eşidəndə ki, Vaqif xəlvəti məktub yazaraq İbrahim Xəlil xanı Qarabağ taxtına dəvət edir, bərk qəzəblənir. Bunu və Vaqifin vaxtilə rusların tərəfində olmasını əsas götürərək onunla oğlunun qətlinə fərman verir. Ata və oğul Xəzinə qayasından atılaraq edam olunurlar.

**Şəmistan Nəzirlinin dedikləri:** "İbrahimxəlil xan 3 aydan sonra Balakəndən qayıtdı. Şuşa əhalisi və ətraf kəndlərdən axışıb gələn camaat xanın pişvazına çıxmışdı. Hamı sevinc və şadlıqla qaladan enib Əsgəran yoluna gəlmişdi. Bəylər, ağalar tüfəng atır, qılınc oynadırdı. Qarabağın səmənd kəhəri üstündə şahanə oturan İbrahimxəlil xan yan-yörəsində baş əyənləri salamlayırdı. Cilov gəmirən xanın atı fınxıra-fınxıra irəliləyir, arabir də başını qaldırıb, Şuşa tərəfə baxır, kəsik-kəsik kişnəyirdi. Bu şadyanalığı, sevinən xalqı görən İbrahimxəlil xan da kövrəlmişdi. Arabir sağ əli ilə atın yalmanını, boynunu sığallayıb deyirdi:

– Hə, Maral, deyəsən, ovlaqlarını görüb tanıdın. Tələsmə, vətənə çatmışıq...

Gəncə qapısını keçən kimi xanın böyük oğlu Məmmədhəsən ağa nökərinə əmr elədi ki, qoy, çal-çağırı, oxumağı yığışdırsınlar. Ağam əvvəlcə Vaqifin məzarını ziyarət edəcək, sonra sarayına gedəcək.

İbrahimxəlil xan Molla Pənah Vaqifin məzarı üstə gəlib, astadan "Yasin" oxumağa başladı. Birdən dayandı, qəhər onu boğurdu. Həyəcandan boğazı qurumuşdu. Sonra surəni tamamlayıb dedi:

– Bizdən sənin pak ruhuna fatihələr, rəhmətlər. Unudulmaz xatirən ki, qəlb dolusu hörmətlər. Dünyanın işinə bax. Mən kimin üçün, nə oxuyuram. 30 il sadiq dost, qardaş kimi qulluğumda duran, sarayımın ən möhkəm dayağı, yaraşığı dəryayi-alim Axund Molla Pənah... Axı, mən yaşda ondan böyüyəm... Zırrama Məmməd bəyə nə deyəsən… Qılıncla vurub, başını ayağının altına atasan…Heyif, bizi külli-Qarabağın sevimli şairindən məhrum etdi".

Məhəmmədhəsən ağa atasına bir az da yaxın gəlib dedi:

– Namərd belə bir ağıllı, müdrik şəxsiyyəti öldürməklə bizim saf Cavanşirlər nəslimizə ömürlük ləkə vurdu.

Xan kövrək səslə:

– Heyif ki, bizim nəsildəndir, amma bizə oxşamadı. Allah bəlasın versin..." [5].

**Məhəmməd bəy Cavanşir kimdir?** Adı Məhəmmədqulu olsa da, Məhəmməd bəy (1762–

1797) deyə çağırılırdı. Mehrəli bəyin oğlu, Pənah xanın nəvəsi, Cəlil Məmmədquluzadənin həyat yoldaşı Həmidə xanım Cavanşirin ulu babasıydı. Qarabağ xanlığının adlı-sanlı sərkərdəsiydi.

Məhəmmədqulu bəy Şuşa şəhərində dünyaya gəlmiş, saray təhsili almışdı. O, 1795-ci ildə qardaşı Əsəd bəylə bərabər Ağaməhəmməd xan Qovanlı-Qacara əsir düşmüş, lakin İbrahimxəlil xan sayəcəsində qurtulmuşdu.

Məhəmməd bəy xanlığa sədaqətli idisə də, əmisi İbrahimxəlil xan Cavanşir heç sevmirdi. Bu, iki səbəbdən irəli gəlirdi. Birincisi, İbrahimxəlil xan öz qızını ona deyil, İran şahı Fətəli xana ərə vermişdi. Halbuki Məhəmməd bəy və Ağabəyim ağa bir-birlərini sonsuz məhəbbətlə sevirdi. İkincisi, İbrahimxəlil xan öz qardaşı arvadını, Məhəmməd bəyin anasını özünə arvad eləmək fikrinə düşmüşdü. Qadın da bu izdivaca razılıq vermişdi. Bundan hiddətlənən Məhəmməd bəy "Atam Mehrəli bəyin bir yastığa baş qoyduğu xanım heç kimin arvadı ola bilməz" deyərək belə sevdaya düşdüyünə görə öz anasını xəncərlə doğramışdı.

Qardaşı arvadını yatağında gözləyən İbrahimxəlil xan eşitdiyi xəbərdən şoka düşür. Məhəmməd bəyi öldürmək istəyir. Lakin onu başa salırlar ki, Məhəmməd bəy xanlığın sütunlarından biridir. Bunu bildiyindən İbrahimxəlil xan da acığını udmalı olur. Lakin onlar arasında gişli düşmənçilik baş qaldırır.

Məhəmməd bəydə Qarabağ taxt-tacına yiyələnmək hərisliyi vardı. Hətta 1797-ci ildə, İbrahimxəlil xan Qarabağ taxtını yiyəsiz qoyub getdiyi ərəfədə qısa müddətə də olsa hakimiyyəti ələ almışdı.

Məmməd bəy Cavanşir Qarabağda Batmanqılınc ləqəbi ilə məşhur idi. Niyə Batmanqılınc?

O, gəzdirdiyi, döyüşdə məharətlə faydalandığı qılıncın ağırlığına görə "Batmanqılınc" ləqəbi daşıyırdı. Döyüş meydanında qalxan götürməz, iki qılıncla vuruşardı. İbrahim xanım hakimiyyəti illərində Qarabağ qoşunlarının sərkərdəsi (müdafiə naziri) olmuşdu. Qılıncları çox ağır idi, hərəsi bir batman. gələrdi. Odur camaat xalq arasında o, Batmanqılınc çağırılardı. Gənclik illərində pəhləvanlıq edərdi. Onun Şuşada Zorxanası vardı. Burda idmanla, güləşlə məşğul olar, ağırlıq qaldırırdı.

Məhəmməd bəy 14 yaşında olarkən atası Mehrəli bəy Şirvan xanı Ağası xan tərəfindən öldürülmüşdür (1785). O, atasının ölümündən çox təsirlənir və Şamaxıya hücum edir. Döyüşdə Ağası xanın beş oğlunu öldürərək atasının qisasını alır. Ağası xanın canına isə qəsd etmir. Onun gözlərini çıxartdırır. Sonra üzünü ona tutaraq deyir: "Mən atasızlıqdan çox əziyyət çəkmişəm. İndi növbə sənindir. Sən də övladlarının acısını çək!"

Məhəmməd bəy cavan yaşlarında dünyasını dəyişir. Nə üçün? Bu, səbəbsiz deyildir. O öz əcəli ilə ölmür, atası kimi o da xəyanət qurban olur.

1797-ci ildə Şəki xanı Məhəmməd bəy Cavanşiri Şəkiyə qonaq çağırır. Dəvətdən boyun qaçırmayan Məhəmməd bəy Şəkiyə yola düşür. Məhəmməd bəy bu səfərə getməyə də bilərdi. Fəqət çağırış şirnikləndirci olur. Şəki xanı ona belə bir xəbər göndərir:

-Mən qocalmışam. Qızımı sənə verib Şəki xanlığını da idarə etməyi sənə tapşırmaq istəyirəm.

Lakin, sən demə, bu çağırış bir kələk imiş. Məhəmməd bəyi tora salmaq istəyirlərmiş. Qonaqlıq vaxtı onun yerməyinə bihuşdar qatırlar. Onun özündə-sözündə olmadığını, dərin yuxuya getdiyini görüb əl-qollarını, ayaqlarını zəncirlə bağlayıb Şamaxıya – II Şamaxı xanı Mustafa xan Xançobanlıya hədiyyə aparırlar.

**Mustafa xan Xançobanlı kimdir?** _ Mustafa xan Şirvan xanı Ağası xanın övladı idi. 1792-ci ildə hakimiyyətə gəlmiş, 1820-ci ilədək Şirvan xanı olmuş, 1844-cü ildə dünyasını dəyişmişdi.

Mustafa xan Xançobanlı gətirilən qənimətdən çox razı qalır. O, atası Ağası xanın, qardaşlarının və əmilərinin intiqamını Məhəmməd bəy Cavanşirdən alır. İlk növbədə onun iki gözünü çıxartdırır, sonra da tikə-tikə doğratdırır.

Ümumtəhsil məktəblərində, orta ixtisas və ali təhsil müəssisələrində ədəbiyyat və Azərbaycan tarixi dərslərində, mühazirə və seminar məşğələlərində haqqında bəhs edilənlərin üzərində dayanmaq məqsədəuyğun olardı.

**Problemin aktuallığı**. Görkəmli Azərbaycan şairi və dövlət xadimi Molla Pənah Vaqifin həyat yoluna nəzər salınır.

**Problemin yeniliyi**. Molla Pənah Vaqifin həyatında baş verən bəzi maraqlı məqamlar diqqətə çatdırılır.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**

1. İlham Əliyev və birinci xanım Mehriban Əliyeva Şuşada Vaqif Poeziya Günlərinin açılışında iştirak ediblər. 20 avqust 2021-ci il. https://president.az/az/articles/view/52881
2. Molla Pənah Vaqif. Əsərləri. Tərtib edəni və ön sözün müəllifi: Həmid Araslı Bakı: Şərq-Qərb, 2004. -269 s.
3. Molla Pənah Vaqif https://az.wikipedia.org/wiki/Molla_P%C9%99nah_Vaqif
4. N.Cəfərov. Vaqifin dövrü, həyatı və dünyagörüşü. http://www.azyb.az/index.php/criticism/post/88
5. Ş. Nəzirli. Molla Pənah Vaqifin faciəli qətli https://xalqqazeti.az/az/sosial-heyat/132680-molla-penah-vaqifin-facieli-qetli

**E-mail:** a.abbasov@arti.edu.az

**Redaksiyaya daxil olub**: 11.07.2024

*UOT 37.0*

***Təranə Mayıl qızı Əkbəri***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şamaxı filialının baş müəllimi,*
*biologiya üzrə fəlsəfə doktoru*
*https://orcid.org/0000-0001-9293-4561*
https://doi.org/10.69682/arti.2024.91(4).10-13

## AZƏRBAYCANIN EKOLOJİ SİYASƏTİNİN FORMALAŞMASINDA ULU ÖNDƏR HEYDƏR ƏLİYEVİN MÜSTƏSNA XİDMƏTLƏRİ

***Тарана Майил гызы Акбари***
*старший преподаватель*
*Шамахинского филиала Азербайджанского Государственного Педагогического Университета,*
*доктор философии по биологии*

## ИСКЛЮЧИТЕЛЬНЫЕ ЗАСЛУГИ ВЕЛИКОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА В ФОРМИРОВАНИИ ЭКОЛОГИЧЕСКОЙ ПОЛИТИКИ АЗЕРБАЙДЖАНА

***Tarana Mayil Akbari***
*senior teacher at*
*Shamakhi branch of Azerbaijan State Pedagogical University,*
*doctor of philosophy in biology,*

## THE EXCLUSIVE ROLE OF THE GREAT LEADER HAYDAR ALIEV IN THE FORMATION OF THE ENVIRONMENTAL POLICY OF AZERBAIJAN

**Xülasə.** Azərbaycan xalqı və ölkənin inkişafında müstəsna xidmətləri olan ulu öndərin fəaliyyəti dövründə ölkədə ekoloji vəziyyət daim xüsusi diqqət mərkəzində saxlanılmış, ətraf mühitin mühafizəsi prioritetləri ilə bağlı tədbirlər həyata keçirilmişdir. Heydər Əliyevin uzaqgörən siyasəti, o cümlədən ekologiya sahəsində tövsiyələri bu gün də həyata keçirilən işlərə istiqamət verir. Ulu öndər Heydər Əliyev Azərbaycana rəhbərlik etdiyi 1969-1982-ci illərdə respublikada həyata keçirilən dünya səviyyəli təbiəti mühafizə tədbirlərinin təşəbbüskarı və təşkilatçısı olmuşdur. Həmin illərdə ulu öndər Heydər Əliyev Azərbaycan Respublikasında ekoloji vəziyyətin yaxşılaşdırılması, təbii sərvətlərdən səmərəli istifadə olunması sahəsində məqsədyönlü siyasət həyata keçirmiş, ekologiya, təbiətin mühafizəsi və təbii sərvətlərdən səmərəli istifadə ilə bağlı Azərbaycan KP MK və Nazirlər Sovetinin 8 qanun və 32 qərarı qəbul edilmişdir. 1993-cü ildə yenidən hakimiyyətə gələn ümummilli lider Heydər Əliyev Azərbaycanda ekoloji vəziyyətin yaxşılaşdırılması və təbii ehtiyatlardan istifadə olunması istiqamətində məqsədyönlü siyasətini uğurla davam etdirmişdir.
***Açar sözlər:*** *Heydər Əliyev, ümummilli lider, ekoloji siyasət, ekologiya, təbiəti mühafizə, ekoloji problemlər, yaşıllaşdırma*

**Аннотация**. В период деятельности Великого Лидера, оказавшего исключительные заслуги в развитии азербайджанского народа и страны, экологическая ситуация в стране всегда находилась в центре внимания. Осуществлялись меры, связанные с приоритетами охраны окружающей среды. Дальновидная политика Гейдара Алиева, в том числе его рекомендации в области экологии, и на сегодняшний день служат направлением в проводимой работе. Великий лидер Гейдар Алиев был инициатором и организатором природоохранных мероприятий мирового уровня, реализованных в республике в 1969-1982 годах, когда он возглавлял Азербайджан. В те годы наш великий лидер

Гейдар Алиев реализовал целенаправленную политику в области улучшения экологической ситуации и эффективного использования природных ресурсов в Азербайджанской Республике, а также были приняты 8 законов и 32 постановления ЦК Компартии Азербайджана и Советом Министров по вопросам экологии, охраны природы и эффективного использования природных ресурсов. Общенациональный лидер Гейдар Алиев, вновь пришедший к власти в 1993 году, успешно продолжил свою целенаправленную политику в направлении улучшения экологической ситуации и использования природных ресурсов в Азербайджане.

***Ключевые слова:*** *Гейдар Алиев, общенациональный лидер, экологическая политика, экология, охрана природы, экологические проблемы, озеленение*

**Abstract.** During the activity of the Great Leader, who had unparalleled services in the development of the Azerbaijani people and statehood, the environmental situation in the country was always in the center of special attention, and measures were taken on the priorities set for environmental protection. Heydar Aliyev's visionary policy, including the recommendations given in the field of ecology, are still being guided by the work done today.

The great leader Heydar Aliyev was the initiator and organizer of the global nature protection measures implemented in the republic in 1969-1982, when he led Azerbaijan. In those years, there were 8 laws on ecology, nature protection and efficient use of natural resources, and 32 decisions of the Central Committee of the Central Committee of Azerbaijan, the Council of Ministers. In those years, our great leader Heydar Aliyev pursued a purposeful policy in the field of improving the ecological situation and efficient use of natural resources in the Republic of Azerbaijan. National leader Heydar Aliyev, who came to power again in 1993, successfully continued his purposeful policy in the direction of improving the ecological situation and using natural resources in Azerbaijan.

***Keywords:*** *Heydar Aliyev, national leader, environmental policy, ecology, nature conservation, environmental problems, landscaping*

Ulu öndər Heydər Əliyevin zəngin maddi sərvətlərimizə – yaşıllığa, meşələrə, dağlara, çaylara, bulaqlara, bir sözlə, təbiətə münasibəti onun azərbaycançılıq ideyasının tərkib hissəsi olmuşdur. Dünyanın tanınmış siyasətçisi, xalqın əbədi lideri, ulu öndərin təbiət sevgisində də dövləti idarə etmək səriştəsi, Azərbaycanı dünyaya tanıtmaq missiyası möhkəm və dönməz idi.

Ulu öndər Heydər Əliyev yaxşı bilirdi ki, Azərbaycanın sabit inkişafı ekoloji problemlərin həllindən çox asılıdır. Hakimiyyətdə olduğu bütün dövrlərdə Azərbaycanda yeni ictimai şüurun formalaşmasına nail olan ulu öndər, eyni zamanda, respublikada yeni ekoloji düşüncənin inkişafına zəmin yaratmışdır. Təbiətə, ekologiyaya yeni baxış, münasibət meydana çıxmışdır.

Ulu öndər Heydər Əliyev Azərbaycana rəhbərlik etdiyi 1969-1982-ci illərdə respublikada həyata keçirilən qlobal təbiəti mühafizə tədbirlərinin təşəbbüskarı və təşkilatçısı olmuşdur. Ölkəmizin flora və faunasının qorunub saxlanılması və inkişaf etdirilməsi məqsədilə respublikada Şirvan (1969), Ağ göl (1978), İsmayıllı (1981), Bəsitçay (1974) və s. dövlət qoruqları və yasaqlıqlarının yaradılması, Abşeron zonasında və Gəncədə iri yaşıllıq massivlərinin salınması, şəhər və rayonlarımızda nəhəng sutəmizləyici qurğuların, iri su hövzələrinin yaradılması, torpaqların şoranlaşmadan təmizlənməsi üçün drenaj sistemlərinin tikilməsi, geniş meşə zolaqlarının salınması, məhz Heydər Əliyevin zəhmətinin bəhrəsi idi.

Həmin illərdə Cənub bölgəsinin iki böyük rayonu olan Lənkəran və Masallı üçün mühüm suvarma dəryaçaları – Xanbulançay və Viləşçay dəryaçalarının yaradılması bir tərəfdən zonada əkin torpaqlarının gen-bol suvarılmasına xidmət edirdisə, digər tərəfdən bu yerlərin təbiətinin zənginləşdirilməsinə, ekoloji mühitə dəymiş ziyanın balanslaşdırılmasına, bu yerlərdə istirahət zonasının inkişafına, qiymətli balıq növlərinin yetişdirilməsinə xidmət edirdi. Sovet dönəmində bu qlobal layihələri həyata keçirmək üçün qarşıya kifayət qədər maneələr çıxırdı. Layihə üçün lazım olan vəsait bəzən respublikanın imkanından xaric olduğundan Heydər Əliyev SSRİ dövlətinin maliyyə mənbələrindən bəhrələnir, SSRİ rəhbərləri ilə münasibətindən istifadə etməklə böyük maliyyə xərclərinin respublikaya yönəlməsini təmin edirdi.

1969-1982-ci illərdə isə torpaqların eroziyadan qorunması barədə həyata keçirilən çox-

saylı tədbirlər, Ceyranbatan gölünün su təchizatı ilə bağlı işlər, Arpaçay tikintisi, Şamxor SES-nin tikintisi, müasir su qurğularının yaradılması, su kəmərlərinin çəkilməsi, meliorasiya tədbirləri, suvarma şəbəkələrinin genişləndirilməsi, parkların salınması işləri həyata keçirildi. Ulu öndərimiz tərəfindən yaşıllaşdırma ümumxalq işi elan olundu. 1971-ci il fevralın 5-də Bakı şəhər partiya konfransındakı çıxışında Heydər Əliyev yaşıllaşdırma tədbirlərini gücəndirmək məqsədilə qarşıya mühüm vəzifə qoydu: "Bakı şəhərində 1 milyon 261 min adam yaşayır. Əgər şəhərin hər bir sakini bir neçə il ərzində ikicə ağac əkib yetişdirsə, Bakının ətrafında neçə-neçə park və meşə salınar".

Azərbaycanda ekoloji vəziyyətin yaxşılaşdırılması və təbii ehtiyatlardan istifadə olunması istiqamətində məqsədyönlü siyasətini 1993-cü ildə yenidən hakimiyyətə gələn respublika Prezidenti davam etdirdi. Ulu Öndərimiz ekoloji məsələləri bir daha ön cərgəyə çəkdi və meşə, torpaq, su və s. haqqında bir sıra yeni qanunlar qəbul edildi.

1998-ci ildə ekoloji prioritetləri müəyyən edən "Ətraf mühitin mühafizəsi üzrə Milli Fəaliyyət Planı" hazırlandı. Bu Proqramda nəzərdə tutulmuş layihələrin həyata keçirilməsi nəticəsində Azərbaycanda müasir Təhlükəli Tullantılar poliqonu, Xıllı Nərə Balıqartırma zavodu inşa edildi. 2003-cü ildə Heydər Əliyev tərəfindən ekoloji siyasətin müasir strategiya sənədi olan "Ekoloji cəhətdən davamlı sosial-iqtisadi inkişafa dair" Milli Proqram təsdiq edildi. Bu strateji proqram əsasında ətraf mühitin müxtəlif sahələri üzrə 4 milli və dövlət proqramları, Kompleks tədbirlər Planı təsdiq edilib və həyata keçirilir.

Heydər Əliyevin rəhbərliyi ilə qəbul edilmiş ekoloji qərarlar, qanunlar, sərəncamlar ölkəmizin təbiətinin sağlamlığına yönəlmişdir. Qeyd edək ki, respublikamızda ekoloji problemlərin həll edilməsini daim diqqətdə saxlayan, xüsusilə yaşıllaşdırmaya böyük önəm verən Ulu Öndər Heydər Əliyevin 2001-ci il 23 may tarixli Fərmanı ilə ətraf mühitin mühafizəsi və təbii ehtiyatlardan istifadənin ayrı-ayrı istiqamətləri ilə məşğul olan və fəaliyyətlərində bir-birini təkrarlayan Dövlət Ekologiya və Təbiətdən İstifadəyə Nəzarət Komitəsi, Dövlət Geologiya və Mineral Ehtiyatlar Komitəsi, Dövlət Hidrometeorologiya Komitəsi və "Azərmeşə" İstehsalat Birliyi ləğv edilib və bunların bazasında Ekologiya və Təbii Sərvətlər Nazirliyi yaradılıb. Respublika Prezidentinin 2001-ci il 18 sentyabr tarixli Fərmanı ilə "Azərbaycan Respublikasının Ekologiya və Təbii Sərvətlər Nazirliyi haqqında Əsasnamə"si təsdiq edilib. Əsasnaməyə görə Azərbaycan Respublikası ərazisində, o cümlədən Xəzər dənizinin (gölünün) Azərbaycan Respublikasına mənsub olan bölməsində ətraf mühitin qorunması, təbiətdən istifadənin təşkili, yeraltı sulardan, mineral xammal ehtiyatlarından və yerüstü təbii sərvətlərdən səmərəli istifadə edilməsi, onların bərpası, hidrometeoroloji proseslərin müşahidəsi və proqnozlaşdırılması sahəsində dövlət siyasətinin həyata keçirilməsi nazirliyə tapşırılıb.

Ümummilli Liderin həyata keçirdiyi ekoloji siyasət bu gün Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Ətraf mühitin, meşələrin, yaşıllıqların qorunması daim ölkə başçısının diqqət mərkəzindədir. Dövlətimizin başçısının 2010-cu ili "Ekologiya ili" elan etməsi, habelə Azərbaycan Respublikasının Birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevanın "Hərəyə bir ağac əkək!" çağırışı nəticəsində respublikamızın hər yerində yaşıllıqların çoxaldılması sahəsində çox böyük işlər görülüb.

BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyası – COP29 kimi mötəbər bir tədbirin Azərbaycanda keçirilməsi ilə əlaqədar yekdil qərarın verilməsi beynəlxalq ictimaiyyət tərəfindən Azərbaycana böyük hörmət və etimadın, eləcə də ölkəmizin milli, regional və qlobal səviyyədə ətraf mühitin qorunması, iqlim dəyişmələrinin qarşısının alınması işinə töhfəsinin bariz nümunəsidir. İqlim dəyişmələrinə qarşı qlobal mübarizədə beynəlxalq həmrəyliyin gücləndirilməsi məqsədilə cənab prezident İ. Əliyevin sərəncamı ilə Azərbaycan Respublikasında 2024-cü il "Yaşıl dünya naminə həmrəylik ili" elan edilmişdir.

**Problemin aktuallığı.** Heydər Əliyevin rəhbərliyi ilə qəbul edilmiş ekoloji qərarlar, qanunlar, sərəncamlar ölkəmizin təbiətinin sağlamlığına yönəlmişdir. Bu iş ardıcıl, müntəzəm və sistem halında görüldüyü üçün böyük səmərə vermişdir. Ümummilli Liderin həyata keçirdiyi ekoloji siyasət bu gün Prezident İlham Əliyev tərəfindən uğurla davam

etdirilir. Məqalənin də aktuallığı onun məhz belə bir vacib mövzuya həsr edilməsi ilə bağlıdır.

**Problemin yeniliyi.** Azərbaycanda yürüdülən ekoloji siyasətin əsas məqsədi indiki və gələcək nəsillərin ehtiyaclarının təmin edilməsi naminə mövcud ekoloji sistemlərin, iqtisadi potensialın qorunması və təbii ehtiyatlardan səmərəli istifadə edilməsi ilə davamlı inkişafın təmin edilməsindən ibarətdir. Bu ənənə xalqımızın ümummilli lideri Heydər Əliyev tərəfindən qoyulub. Göründüyü kimi ulu öndər Heydər Əliyevin ətraf mühitin mühafizəsi sahəsində əsasını qoyduğu siyasət bu gün Azərbaycan Prezidenti İlham Əliyevin rəhbərliyi altında uğurla davam etdirilir. Bu sahədə həyata keçirilən ardıcıl tədbirlər, görülmüş mühüm işlər ekologiya və ətraf mühitin mühafizəsi sahəsində də yeni nailiyyətlərin əldə olunmasına şərait yaradıb. Məqalədə Ulu Öndər Heydər Əliyevin Azərbaycanın ekoloji siyasətinin formalaşmasında müstəsna xidmətlərindən bəhs olunur.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Hüseynov B.B. Azərbaycan təbiəti: dünən, bu gün, sabah: ekoloji təbliğat, tədqiqat və maarifləndirmə / - Bakı: Vətənoğlu NPŞ MMC, -2015.- 496 s.
2. Hüseynov, B.B. ”Heydər Əliyev və Azərbaycan təbiəti ” // Xalq qəzeti.- 2024, 27 may-s.3
3. Bağırov H.S. Azərbaycanda ekoloji problemlərin həlli istiqamətində irəliləyişlər //-Bakı: Dövlət idarəçiliyi: nəzəriyyə və təcrübə jurnalı,-2014. № 1.-s.105-116.
4. Bağırov H.S. Müasir Azərbaycanın balanslaşdırılmış davamlı ekoloji inkişaf strategiyası // Xalq qəzeti.- 2015, 12 may. -s. 6.
5. Azərbaycan Respublikası Prezidentinin 2001-ci il 23 may tarixli 485 nömrəli Fərmanı / https://e-qanun.az/framework/2993

**E-mail:** akbarietmp@gmail.com
**Redaksiyaya daxil olub:** 24.06.2024

UOT 37.0

***Samirə Mahir qızı Seyidli***
*Şamaxı Dövlət Regional Kollecinin müəllimi*
*https://orcid.org/0009-0007-7428-5765*
https://doi.org/10.69682/arti.2024.91(4).14-16

# ULU ÖNDƏR HEYDƏR ƏLİYEV FENOMENI: TARİX VƏ ŞƏXSİYYƏT

***Самира Махир гызы Сеидли***
*преподаватель Шамахинского Государственного Регионального колледжа*

## ФЕНОМЕН ВЕЛИКОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА: ИСТОРИЯ И ЛИЧНОСТЬ

***Samira Mahir Seyidli***
*teacher at Shamakhi State Regional College*

## GREAT LEADER HEYDAR ALIYEV PHENOMENON: HISTORY AND PERSONALITY

**Xülasə.** Bu elmi araşdırmalarımda Ümummilli Lider Heydər Əliyevin siyasi fəaliyyəti, əsasən, XX əsrin ikinci yarısı ilə bağlıdır. Bütövlükdə XX əsr bəşər tarixində bir çox təlatümlü hadisələrin baş verdiyi, iki dünya müharibəsinin od ələdiyi, çoxsaylı milli dövlətlərin meydana gəldiyi, siyasi və iqtisadi böhranların qaçılmaz olduğu və eyni zamanda, dünya inkişafına təkan verən proseslərin yaşandığı qlobal ziddiyyətlərlə dolu dramatik yüzillik kimi səciyyələndirilir. Bəşəriyyət məhz tarixi şəxsiyyətlərin sayəsində ziddiyyətli, odlu-alovlu dünyadan sabit və dayanıqlı dünyaya keçid aldı.
***Açar sözlər:*** *Ümummilli, lider, şəxsiyyət, təhlükəsizlik, bəşəriyyət, fəaliyyət, iqtisadi, ziddiyyət*

**Аннотация**. В данном научном исследовании политическая деятельность Общенационального Лидера Гейдара Алиева связана в основном со второй половиной XX века. В целом XX век характеризуется как драматический век, полный глобальных противоречий, где в истории человечества произошло немало бурных событий, разразились две мировые войны, возникли многочисленные национальные государства, политические и экономические кризисы были неизбежны, но в то же время происходили процессы, стимулирующие мировое развитие. Именно благодаря историческим личностям человечество совершило переход от мира конфликтного, огненного к миру устойчивому и стабильному.
***Ключевые слова:*** *общенациональный, лидер, иличность, безопасность, человечество, деятельность, экономика, противоречие*

**Abstract.** In these scientific studies, the political activity of National Leader Heydar Aliyev is mainly related to the second half of the 20th century. As a whole, the 20th century is characterized as a dramatic century full of global contradictions, where many turbulent events took place in human history, two world wars broke out, numerous nation-states emerged, political and economic crises were inevitable, and at the same time, processes that spur world development were experienced. It is precisely thanks to historical figures that humanity made the transition from a conflicting, fiery world to a stable and stable world.
***Keywords:*** *Nationwide, leader, identity, security, humanity, action, economic, conflict.*

Xalqımızın Ümummilli Lideri Heydər Əliyevin şüarlı həyatının bütün mərhələləri Azərbaycan xalqının müstəqil dövlətə sahib olmasına, onun dünya xalqları içərisində firəvan həyatının təmin edilməsinə yönəltmişdir. Ulu Öndər Heydər Əliyev hələ Dövlət Təhlükəsizlik Komitəsində işləyərkən bu orqanda fəaliyyət göstərəcək milli kadrların hazırlanması Ümummilli lider Heydər Əliyevin siyasi fəaliyyəti, əsasən, XX əsrin ikinci yarısı ilə bağlıdır. Bütövlükdə XX əsr bəşər tarixində bir çox təlatümlü hadisələrin baş verdiyi, iki dünya müharibəsi-

nin od ələdiyi, çoxsaylı milli dövlətlərin meydana gəldiyi, siyasi və iqtisadi böhranların qaçılmaz olduğu və eyni zamanda, dünya inkişafına təkan verən proseslərin yaşandığı qlobal ziddiyyətlərlə dolu dramatik yüzillik kimi səciyyələndirilir. Bəşəriyyət məhz tarixi şəxsiyyətlərin sayəsində ziddiyyətli, odlu-alovlu dünyadan sabit və dayanıqlı dünyaya keçid aldı. da müstəsna xidmətlər göstərmişdir. Ulu Öndər Heydər Əliyev çox gözəl bilirdi ki, dövlət təhlükəsizlik orqanlarında işləyən qeyri-azərbaycanlılar tərəfindən xalqımıza qarşı olduqca qəddar münasibət bəslənmiş, minlərlə soydaşımız müxtəlif bəhanələr gətirilərək uzunmüddətli həbslərə, ölüm cəzasına məhkum edilmişdir. Xalqımıza qarşı yönəlmiş bu repressiya maşınının qarşısını alınmasının yeganə yolu Dövlət Təhlükəsizlik Komitəsi sistemində milli kadrların yerləşdirilməsi idi ki, Ulu Öndər bu yolda qarşısına çıxan maneələri qətiyyətlə dəf etməyi bacardı. Ümummilli lider Heydər Əliyevin siyasi baxışlarına daha dərin məna qazandırır, onun Vətənimizin bu gününə və gələcəyinə çox möhkəm tellərlə bağlı olduğunu daha aydın göstərir. Böyük siyasi mütəfəkkir kimi, Ümummilli liderin keçdiyi həyat yolu və bütöv bir xalqın gələcəyini müəyyən edən uğurlu siyasi kursunun kökündə dayanan səbəblər haqqında çoxsaylı dəyərli əsərlər yazılmışdır.

Bu araşdırmalarda Ulu öndər Heydər Əliyev yeni tarixdə xalqımızın yetişdirdiyi ən böyük düha sahibi kimi xarakterizə olunur və bu şəksizdir. Lakin Heydər Əliyev şəxsiyyətinə təkcə Azərbaycan kontekstində deyil, daha geniş miqyasda – XX əsrin qlobal siyasi aynasında baxmaq, dünya siyasətinin formalaşmasında mühüm rol oynamış siyasi xadimlərlə, dövlət rəhbərləri ilə bir sırada nəzər salmaq Onun siyasi portretini daha önəmli cizgilərlə zənginləşdirmiş olar. Ümummilli lider Heydər Əliyevin siyasi fəaliyyəti, əsasən, XX əsrin ikinci yarısı ilə bağlıdır. Bütövlükdə XX əsr bəşər tarixində bir çox təlatümlü hadisələrin baş verdiyi, iki dünya müharibəsinin od ələdiyi, çoxsaylı milli dövlətlərin meydana gəldiyi, siyasi və iqtisadi böhranların qaçılmaz olduğu və eyni zamanda, dünya inkişafına təkan verən proseslərin yaşandığı qlobal ziddiyyətlərlə dolu dramatik yüzillik kimi səciyyələndirilir. Bəşəriyyət məhz tarixi şəxsiyyətlərin sayəsində ziddiyyətli, odlu-alovlu dünyadan sabit və dayanıqlı dünyaya keçid aldı. Həyat və mübarizə yollarına nəzər saldığımız liderlər fəaliyyət göstərdikləri məkanın coğrafi sərhədlərini aşaraq universal düşüncə sahibləri, dünyanın yeni sosial yaşam, yeni siyasət reallıqlarını ərsəyə gətirən yaradıcı insanlar kimi tanınmışlar. Onlar üçün məkan və zaman fərqi yoxdur. Ulu öndər Heydər Əliyevin malik olduğu ali insani keyfiyyətlər və siyasi qabiliyyətlər ona istənilən siyasi mühitdə və istənilən coğrafi məkanda siyasi elitanın ən yüksək pilləsində qərarlaşmağı təmin edə bilərdi. Belə bir dühanın məhz Azərbaycan xalqına mənsub olması və özündən sonra bu xalqın tarixində yaradıcı iz və daha uzaq gələcəyə hesablanmış siyasi irs qoyması bütövlükdə xalqımızın milli uğuru və iftixar mənbəyidir. Müasir dünya tarixində yaradıcı iz qoymuş digər tarixi şəxsiyyətlərlə ortaq məziyyətlər daşıdığı üçün və bəzi hallarda isə həmin siyasi xadimləri belə üstələyən keyfiyyətlərə malik olduğu üçün Ulu öndər Heydər Əliyev dünya miqyaslı fenomenal şəxsiyyətdir, Azərbaycan xalqının hər zaman fəxr edəcəyi və həyat yolundan ibrət götürəcəyi böyük bir mütəfəkkirdir. Ulu öndər Heydər Əliyev bir çox siyasətçi müasirlərindən fərqli olaraq təkcə öz dövrünün deyil, daha geniş zaman çərçivəsində baş verən ictimai-siyasi proseslərin axarını müəyyən edə bilən güclü siyasi iradə sahibi, yeni dünya tarixinin rasional siyasətçisi, uzaqgörən bir dövlət xadimidir. Heydər Əliyev təkcə gələcəyi görmür, həm də o gələcəyi yaradır: Sabaha doğru gedən yolu açır və insanları o yolla getməyə səfərbər edir.

Ulu öndər Heydər Əliyevin istər Azərbaycan SSR-ə rəhbərlik etdiyi, istərsə də Sovet İttifaqının rəhbərliyində təmsil olunduğu zaman göstərdiyi siyasi əzmkarlıq və yorulmaz siyasi fəaliyyəti Ona həmkarlarından tamamilə fərqlənən nadir şəxsiyyət imici qazandırmışdı. Dünya inkişafının perspektivini aydın görən, ona doğru addımlayan və ölkəsini, xalqını ona doğru istiqamətləndirən Heydər Əliyevin uzaqgörən siyasəti isə müasir Azərbaycanın dünya birliyinə təbii inteqrasiyasını təmin edərək onun müstəqilliyini əbədi və dönməz etdi. Bu siyasət, hər şeydən əvvəl, uzunmüddətli sabitliyin bərqərar olunmasına yönəlmişdir; bu siyasət zaman çərçivəsi ilə məhdudlaşmır - gələcəyə hədəflənmişdir; bu siyasət geopolitik maraqları toqquşdur-

mur, əksinə, həmin maraqların Azərbaycanın milli mənafeləri ilə uzlaşan ideal harmoniyasını yaradır. Məhz bu siyasət hələ uzun illər Azərbaycanın daxili və xarici siyasət doktrinasının özəyini, milli inkişafımızın təməlini təşkil edəcəkdir. Məhz bu cəhətləri Heydər Əliyev siyasətini qlobal siyasət səviyyəsinə yüksəldir və onun özünü isə dünya miqyaslı şəxsiyyətə çevirir.

Məhz onun yorulmaz səyləri nəticəsində Azərbaycan konservativ, tipik postsovet ölkəsi kimi deyil, beynəlxalq və regional müstəvidə sabit və davamlı inkişaf vəd edən bərabərhüquqlu tərəfdaş kimi tanınmağa başladı. Heydər Əliyev şəxsiyyəti o qədər zəngindir ki, istənilən aspektdən yanaşdıqda onun intəhasız fəaliyyətinin geniş okeanına çıxa bilirsən. Öyrənildikcə öyrənilən, heç zaman tükənməyən Heydər Əliyev irsi, onu müasiri olduğu digər dünya siyasətçilərindən fərqləndirən siyasi dühası, onun yaradıcı zəkası hələ uzun illər çoxtərəfli araşdırmaların mövzusu olacaq. Hər zaman bu şəxsiyyətin tarixdə oynadığı əhəmiyyətli rol daha dərin məzmunda, daha geniş panoramda və daha konseptual şəkildə açılacaq. Amma bir həqiqət heç zaman dəyişməyəcək: Heydər Əliyev müasir Azərbaycanımızın qurucusu olmaqla yanaşı, tərəqqi və ədalət, sülhpərvərlik və humanizm ideyalarına əsaslanan geniş spektrlı fəaliyyəti ilə bəşər tarixinin yetişdirdiyi nadir şəxsiyyətlərdəndir.

**Problemin aktuallığı.** Müasir dünya tarixində yaradıcı iz qoymuş digər tarixi şəxsiyyətlərlə ortaq məziyyətlər daşıdığı üçün və bəzi hallarda isə həmin siyasi xadimləri belə üstələyən keyfiyyətlərə malik olduğu üçün Ulu öndər Heydər Əliyev dünya miqyaslı fenomenal şəxsiyyətdir, Azərbaycan xalqının hər zaman fəxr edəcəyi və həyat yolundan ibrət götürəcəyi böyük bir mütəfəkkirdir.

**Problemin elmi yeniliyi:** Ulu öndər Heydər Əliyev Azərbaycan xalqının rifahını, milli dövlətçiliyimizin daha da güclənməsini hər şeydən üstün tutan vətənpərvər lider idi. Ulu öndər Heydər Əliyev Azərbaycan xalqının rifahını, milli dövlətçiliyimizin daha da güclənməsini hər şeydən üstün tutan vətənpərvər lider idi. Ömrünün son on ilində Heydər Əliyevin fəaliyyəti hətta bir insan ömrünə sığmayacaq qədər zəngin oldu. Xarici ölkələrə etdiyi davamlı səfərlərlə, daxili və xarici siyasətimizin dayaqlarını yaratmaqla, ümumən, bütün ölkənin yenidən qurulmasına rəhbərlik etməklə, Heydər Əliyev Yeni Azərbaycanın əsasını qoydu.

**Problemin praktik əhəmiyyəti:** Dünya inkişafının perspektivini aydın görən, ona doğru addımlayan və ölkəsini, xalqını ona doğru istiqamətləndirən Heydər Əliyevin uzaqgörən siyasəti isə müasir Azərbaycanın dünya birliyinə təbii inteqrasiyasını təmin edərək onun müstəqilliyini əbədi və dönməz etdi.

**Ədəbiyyat:**


1. Əhmədov H. H. "Azərbaycan Təhsilinin inkişaf Strategiyası". // -Bakı: Elm. -2010. -800 s.
2. Cəbrayılov İ.H. "Müstəqillik illərində Azərbaycanda ali təhsilin inkişaf istiqamətləri". Müstəqillik dövründə Azərbaycan Təhsili: nəzəri və praktik aspektlər. //. -Bakı: 2017. -s.13-76.
3. Azərbaycan Respublikasında Ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu) // - Azərbaycan məktəbi. -2007. № 2.
4. Mərdanov M. C. Azərbaycan təhsili yeni inkişaf mərhələsində. // (4 cilddə) III cild. - Bakı: Təhsil nəşriyyatı, 2011. -672 s.



**E-mail:** fariwka_2009@mail.ru



**Redaksiyaya daxil olub:** 24.06.2024

*PEDAQOQLARIN YUBİLEYLƏRİ*
*ЮБИЛЕЙ ПЕДАГОГОВ*
*TEACHERS' ANNIVERSARY*

## *Professor Əbülfət Pələngov – 65*
## *Профессору Абульфату Палангову – 65 лет*
## *Professor Abulfat Palangov – 65 years*



*UOT 371*

***Akif Nurağa oğlu Abbasov***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi,*
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*https://orcid.org/0000-0002-9210-7141*
https://doi.org/10.69682/arti.2024.91(4).17-19

## PROFESSORUN HƏYAT VƏ FƏALİYYƏT YOLU

***Акиф Нурага оглы Аббасов***
*ученый секретарь Института Образования Азербайджанской Республики,*
*доктор педагогических наук, профессор, заслуженный учитель*

## ЖИЗНЬ И ДЕЯТЕЛЬНОСТЬ ПРОФЕССОРА

***Akif Nuragha Abbasov***
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan.*
*doctor of pedagogical sciences, professor, Honored teacher*

## LIFE AND ACTIVITY OF A PROFESSOR

**Xülasə.** Əbülfət Qulam oğlu Pələngov pedaqogika elmləri doktoru, professordur. Azərbaycan Dövlət Pedaqoji Universitetində kafedra müdiridir. Bu il onun anadan olmasının 65 illiyi tamam olur. Məqalədə professorun həyat və fəaliyyət yolu işıqlandırılır. O, 100-dəm çox elmi əsərin müəllifidir.
***Açar sözlər:*** *professor, kafedra müdiri, elmlər doktoru, 65 illik yubiley, professorun həyat və fəaliyyəti*

**Аннотация.** Абульфат Гулам оглы Палангов – доктор педагогических наук, профессор. Он является заведующим кафедрой Азербайджанского государственного педагогического университета. В этом году исполняется 65 лет со дня его рождения. В статье освещена жизнь и деятельность профессора. Он автор более 100 научных работ.

***Ключевые слова****: профессор, заведующий кафедрой, доктор наук, 65-летие, жизнь и деятельность профессора*

**Abstract**. Abulfat Gulam ogly Palangov – doctor of pedagogical sciences, professor. He is the head of the department at the Azerbaijan State Pedagogical University. This year marks the 65th anniversary of his birth. The article covers the life and work of the professor. He is the author of more than 100 scientific works.

***Keywords****: professor, head of department, doctor of sciences, 65th anniversary, life and work of the professor*

İnsan doğulduğu gündən ömrünün sonuna kimi qarşılıqlı münasibətlər sistemində olur: ailə mühiti, ata-ana, bacı-qardaş, ailənin digər üzvləri ilə, qohum-əqrəba, qonşularla münasibətlər. Sonra uşaq bağçasında, ümumtəhsil məktəbində, kollec və ali təhsil müəssisəsində, iş yerində tərbiyəçilərlə, həmyaşıdlarla, sinif yoldaşları, tələbə dostlarla, iş yoldaşları ilə münasibətlər. Hər dövr, hər an özünəməxsus səciyyəvi xüsusiyyətləri ilə seçilir. özünə yoldaş, dost seçirsən. Bu yoldaşlığın, dostluğun ömrü nə qədər olur? Hər şəxsə yoldaş demək olar, amma hər insana dost demək mümkün deyil.

İllər keçir. Yoldaşı da, dostları da sınağa çəkirsən. Bəzən hər dövrün öz yoldaşları, öz dostları olur. Hünər odur ki, ömrünün sonuna kimi bu yoldaşlığı, bu dostluğu qoruyub saxlaya biləsən. Həyatda dostsuz keçinmək olmur. Atalarımız heç də təsadüfi deməmişlər: "Dostsuz insan qanadsız quş kimidir",

Yoldaşlığın öz, dostluğun öz tələbləri var. Gərək onlara əməl olunsun.

Bu sınaqlardan mən də keçmişəm. Yoldaşlarım, dostlarım çox olub. Ələnib bu günkü gününüzə çox azı qalıb. Kimisi dünyasını dəyişib, kimisi özünü doğrultmayıb.

Çox yollar, çox dərələr, çox dağlar aşıb gəlib çıxmışıq müəyyən yaşa. Dönüb gəldiyimiz yollara baxanda öz şəxsiyyəti, öz əqli, öz təfəkkürü, öz insanlığı, öz sədaqəti ilə yanında olanları anır, dəyərləndiririk. Əbülfət Pələngov kimi. Müdrik atalarımız demişdən "Dostluğa dağlar da, dəniz də mane ola bilməz". Əbülfət də yoldaşlıqda, dostluqda sədaqətli, təmənnasızdır.

Kimdir Əbülfət Pələngov?

Pedaqoji aləmdə bu şəxsi yaxşı tanıyırlar. Yaxşı iş təcrübəyə, pedaqoji ustalığa, metodik hazırlığa malik olan orta məktəb və ali məktəb müəllimi kimi! İstedadlı, dəyərli alim kimi: pedaqogika elmləri doktoru, professordur.

Gözəl insan kimi. Xeyirxahlıq, yaxşılıq Əbülfətin xislətindədir. Budur onu gözlləşdirən, sevdirən. Viktor Hüqonun sözləridir: "İnsanın daxilindəki yaxşılıq – günəşdir". Bu xüsusiyyət Əbülfətdə də vardır.

1959-cu ilin iyun ayının 17-də Lerik rayonunun Züvüc kəndində dünyaya göz açmış Əbülfət Qulam oğlu Pələngov pedaqoji elmlər, riyaziyyat, informatika və proqramlaşdırma üzrə kamil mütəxəssisdir. Əbülfətin orta təhsil aldığı Züvüc kənd məktəbi hazırda onun qardaşı Bünyadəlinin adını daşıyır. Bünyadəli Qarabağ müharibəsi şəhididir. Vətənimizin işğal altında olan torpaqlarının azad olunması yolunda canından keçmişdir.

Ə.Q. Pələngov ali təhsilini Azərbaycan Dövlət Pedaqoji Universitetində almışdır. Riyaziyyat fakültəsinin məzunudur. Ali təhsil aldıqdan sonra ilk əvvəllər Biləsuvar (keçmiş Puşkin) rayonu Nəirimanovka kəndində, daha sonra rayonun Səmədabad kənd məktəblərində riyaziyyat müəllimi işləmişdir.

"Ölçmə xarakterli praktik və laborator işləri şagirdlərin həndəsi biliklərini formalaşdıran vasitə kimi" mövzusunda namizədlik (1996), "Orta məktəb həndəsə kursu təlimində müasir metodların kompüter texnikası ilə əlaqəli tətbiqinin reallaşdırılması problemləri" mövzusunda doktorluq (2010) dissertasiyaları müdafiə etmişdir.

Ə.Q. Pələngovun pedaqoji fəaliyyəti daha çox Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə bağlıdır. Bu ali təhsil müəssisəsində o, hesablama riyaziyyatı və informatika kafedrasında əvvəlcə müəllim, sonra baş müəllim, dosent; riyaziyyat fakültəsinin dekan müavini və dekan əvəzi (2001-2007) vəzifələrində çalışmışdır. Hazırda riyaziyyatın ibtidai kursunun tədrisi texnologiyası kafedrasının müdiridir (2023-cü ildən).

Professor Əbülfət Pələngov Azərbaycan Dövlət Pedaqoji Universitetində alqoritmlər nəzəriyyəsi, informatikanın nəzəri əsasları, informatikanın tədrisi metodikası və təhsildə İKT fənlərindən mühazirələr oxuyur.

Ə.Q. Pələngov riyaziyyatın kompüter texnologiyası ilə tədrisi ilə bağlı öyrədici proqramlar

göstərən faktor sayılır. Onun kəmiyyətcə göstəricisi geniş coğrafi, mövsümi və sutka bitkilərdə olduğu kimi, hava şəraiti poykiloterm heyvanlarda da əks olunur, homoyoferm heyvanlar isə buna öz davranışlarının dəyişməsi ilə cavab verir, yuvasalma, miqrasiya və vaxtı dəyişdirilir. İnsan yuxarıda göstərilən hadislərdən istifadə etməyi öyrənmişdir. İşıqlı günün uzunluğunu süni olaraq dəyişərək bununla da bitkinin çiçəkləmə və meyvəvermə vaxtını dəyişmək (qış dövründə istixanalarda şitil, hətta meyvə yetişdirmək), toyuqların yumurtalama qabiliyyətini artırmaq olar. Canlı təbiət ilin mövsümləri üzrə hadisələri yerin en və uzunluq dairəsindən, onun dəniz səviyyəsindən yüksəkliyindən asılıdır. Deməli, ərazi şimal, şərq və daha yuxarı ərazilərdə yaz gec, payız tez gəlir. Belə ki, səhrada qum səthində temperatur 600 C-yə qalxa bilir, Şərqi Sibirdə isə havanın minimum temperaturu mənfi 700 C-yə enir. Ümumiyyətlə, +50-dən -500 C temperatur diapazonu biosferdə temperatur şəraitin fundamental xarakteristikası hesab olunur, hərçənd bu parametrlərdən sapmalar da olur. Suyun miqdarı kəskin dəyişməyə məruz qalarsa (qabarma, çəkilmə), çox duzlu sularda osmotik yolla orqanizmlər tərəfindən itirilirsə, ekoloji baxımdan, həm yerüstü, həm də su ərazilərində limitləşdirici amil hesab olunur.

Su canlı orqanizmlərin fəaliyyətində mühüm əhəmiyyətə malikdir. O, biokimyəvi reaksiyalar üçün əsas mühit, protoplazmanın vacib tərkib hissəsidir. Qida maddələri orqanizmdə əsasən su məhlulu şəklində dövr edir, bu şəkildə də orqanizmdən dissimlyasiya məhsulu yüksək dərəcədə xaric edilir. Su bitki və heyvan orqanizmlərinin əsas kütləsini təşkil edir, toxumalarda onun nisbi miqdarı 50-80%, bəzi növlərdə isə daha yüksək olur. Belə ki, meduzaların bədənində 95%-ə, bir çox molyuskların toxumalarında isə 92%-ə qədər su vardır. Hüceyrədaxili və hüceyrələrarası mübadilə, hidrobiontlarda isə xarici mühitlə osmotik qarşılıqlı əlaqə suyun və onun tərkibində həll olan duzların miqdarından çox asılıdır. Heyvanlarda qaz mübadiləsi yalnız rütubətli səthin mövcudluğu şəraitində mümkündür. Yerüstü orqanizmlərdən buxarlanma mühitlə istilik balansının formalaşmasında iştirak edir. Sənaye məhsullarının Dəniz sahilləri antropogen təzyiqlərə daha çox məruz qalan və bu təzyiqlər durmadan artan şəraitdə quru, okean və atmosferin qarşılıqlı əlaqədə olan Yer səthinin bir hissəsidir. Bu üç geosferin qarşılıqlı əlaqəsi nisbətən enli olmayan zonası olmaqla, həm də spesifik sahilyanı təbii təsərrüfat sistemi fəaliyyət göstərən enli zolaqdır.

Dəniz sahilboyu ərazi dedikdə adətən şərti olaraq dəniz səviyyəsindən 200 m-ə qədər izogips və dəniz səviyyəsindən 200 m qədər izobat arasındakı ərazi başa düşülür. Dəniz sahilboyu təbii-təsərrüfat sistemi – ekosferin olduqca mühüm komponenti olub həm dünya təsərrüfatına, həm də qlobal təbii proseslərə təsir göstərir. İstehsalı gündən günə artır, bu da metallurgiya, kimya, neft, qaz və kömür istehsalı sənayelərinin atmosferə atılan tullantılarının miqdarının artmasına gətirib çıxarır. Həmçinin qaz, kömür və mazutla işləyən istilik energetikasının tullantılarının həcmi də artıb. Radionuklidlər yer səthinə əsasən atmosfer yağıntıları vasitəsilə daxil olur və onların maksimum çöküntüləri yaz-yay fəsillərinə təsadüf edir. Bu qanunauyğunluq atmosferdə gedən meteoroloji proseslərlə əlaqədardır. Su mühitində atmosferin radionuklidləri suspenziya şəklində həll olur, bu vəziyyətdə də onlar torpağa hopur, qrunt sularına daxil olur.

Təmiz su hövzələrində və su axarlarında radionuklidlərin böyük hissəsi dib çöküntüləri və ali su bitkiləri tərəfindən sorbsiya olunur. Az miqdarda radionuklidlər az-çox bərabər miqdarda həll olunmuş halda suda qalır. Radioaktiv çirklənmiş su obyektlərində ən çox miqdarda stronsium – 90 və sezium – 137 radionuklidləri olur.

Onlar uzun yarımparçalanma dövründə və yüksək toksikliyə malik olduğu üçün təhlükəlidir. Qrunt suyu torpaq səthinə yaxın olan, şorlaşma getməyən və zəif duzlu torpaqlarda irriqasiya qoruyucu meşə zolaqlarını qoşalaşdırılmış (ikiləşdirilmiş) cərgələrlə salmaq faydalıdır. Belə əkinlərdə tinglər şırımın hər iki tərəfində və ya qarşı-qarşıya əkilir. Meşə zolaqlarının kənar cərgələrində meyvə, kol və ya alçaq boylu ağaclar, kanal tərəfdəki cərgələrdə isə kök sistemi dərin gedən, transpirasiya xüsusiyyəti yüksək olan, ucaboylu, uzunömürlü və tezböyüyən ağac cinslərinin əkilməsi faydalıdır. Əkin cərgələrinin uzunluğunu 100 (meyilli yerlərdə 25-30 m) metrdən artıq götürmək məsləhət görülmür. Tinglər çalaya şaquli istiqamətdə qoyulmalı, kök sisteminin torpaqla təmasda olmasını təmin etmək üçün əvvəlcə çalaya azca torpaq tökməli,

sonra ting çalaya qoyulmalı, çala torpaqla doldurulmalı və bitkinin ətrafı tapdalanmalıdır. Bütün cərgələr düz xətt boyunca əkilməlidir.

Əhalinin artımı Yerin təbii sistemlərinə antropogen təzyiqi artırır. Daim artmaqda olan əhalini ərzaqla təmin etmək üçün məhsul istehsalını artırmaq tələb olunur, bunun üçün kənd təsərrüfatı istehsalına yeni (xam) torpaqlar daxil etmək, yaxud mövcud torpaqları hədsiz istismar etmək lazımdır, bu isə torpaqların eroziyasına, səhralaşmasına və çirklənməsinə (toksifikasiyasına) səbəb olur.

Sosial-iqtisadi inkişaf səviyyəsindən asılı olmayaraq əhali sayının artımını azaltmaq bütün ölkələrin mühüm vəzifəsi sayılır. Lakin bu zaman müxtəlif ölkələrdə adət-ənənə, dini qadağalar və əhalinin bu problemə olan münasibəti nəzərə alınmalıdır.

Ekoloji mədəniyyətin ölçüsü kimi ekoloji etika çıxış edir. Ekoloji etikaya əxlaq münasibətləri sferasında «insan-insan», «insan-cəmiyyət» ənənəvi münasibətləri ilə yanaşı «insan-təbiət» münasibətlərinin bir sıra cəhətləri daxil edilmişdir. Ekoloji etikaya məxsus olan əsas xassələr içərisində aparıcı xüsusiyyəti gələcək nəsillərin yaşayacağı təbii mühitə olan qayğı təşkil edir. Ekoloji etikanı onun ənənəvi istiqamətlərindən fərqləndirən onun üzünü gələcəyə çevirməklə, indinin qayğısına qalmasıdır.

XXI - əsr İnkişafı sosial, iqtisadi və ekoloji baxımdan necə dayanıqlı etmək olar ki, ətraf mühitdə dəyişkənlik yaradan hərəkətedici qüvvələrin əhali, istehlak və texnologiya olduğu bir dövrdə bütün xalqlara daha təhlükəsiz və təminatlı gələcək bəxş edə bilək.

**Problemin aktuallığı.** Ekoloji etikaya məxsus olan əsas xassələr içərisində aparıcı xüsusiyyəti gələcək nəsillərin yaşayacağı təbii mühitə olan qayğı təşkil edir. Ekoloji əxlaq anlayışı ilə birlikdə bütün dünyada ekoloji problemlər və onların aradan qaldırılması üçün bir işıq oldu. İnsanların dünyanın bu ekoloji problemlərinə həssas olmamaları və əvvəllər fəlsəfədə mövcud olan tibbi etika və iş etikası kimi nəzəriyyələrin mövcudluğu bu konsepsiyaya fəlsəfi yanaşmada təsirli olmuşdur. Bu nəzəriyyələrə əlavə olaraq, fəlsəfənin alt nəzəriyyəsinə çevrilmişdir.

**Problemin elmi yeniliyi.** Ekoloji etikaya məxsus olan əsas xassələr içərisində aparıcı xüsusiyyəti gələcək nəsillərin yaşayacağı təbii mühitə olan qayğını təşkil etməliyik. Gələcək nəsillərin yaşaması imkanını pozan istənilən hərəkətdən imtina etmək, təbii mühitin vəziyyətinə təsir göstərən qərarların qəbulunda gələcək nəsillər qarşısındakı məsuliyyət ölçüsü aparıcı olmalıdır. İndiki nəsillərin mənafeyinə görə gələcək nəsillərə ziyan vurulmasına yol verilməməlidir.

**Problemin praktik əhəmiyyəti.** Bu məsələnin aktuallığı və onun həyata keçirilməsinə demoqrafik problemlərə həsr olunmuş beynəlxalq forumlarda baxılmışdır. Orada qeyd olunmuşdur ki, demoqrafik problemin həlli dayanaqlı inkişafın milli strategiyasının bir hissəsi olmalıdır və bütün ölkələr demoqrafik proqramlar işləyib hazırlamalıdır. Belə yanaşmanın son məqsədi də, bilavasitə olmasa da, onun mövcud olduğu təbii mühiti saxlamaqla yenə də insandır.

**Ədəbiyyat:**


1. Məmmədov Q.Ş. Xəlilov M.Y. / Ekologiya və ətraf mühitin mühafizəsi./ - Bakı: Mütərcim,- 2005.- 880 s.
2. Aslanov H.Q. / Meliorasiya torpaqşünaslığı./ -Bakı: – Elm, - 1999. - 346 s.
3. Avazova M.A. Respublika torpaqlarının müasir ekoloji vəziyyəti // «Təbii sərvətlərin qiymətləndirilməsi və təbiətdən istifadə» mövzusunda elmi-praktik konfransın tezisləri. -Bakı: 2003, -s.340-342.
4. V.İ. Korobkin, L.V. Peredelski. / Ekologiya / Dərslik (rus dilindən tərcümə). -Bakı: İqtisad Universitetinin nəşriyyatı, -2013. - 434 s.



**E-mail:** zerifehemidova16@mail.ru



**Redaksiyaya daxil olub:** 01.07.2024

*UOT 372.0:002*

***Səbinə Etibar qızı Babayeva***
*Gəncə Dövlət Universitetinin*
*İnformatika və cəbr kafedrasının müəllimi,*
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*http://orcıd.org/0009-0001-8364-6258*
*https://doi.org/10.69682/arti.2024.91(4).36-41*

# ALİ TƏHSİL MÜƏSİSƏLƏRİNDƏ TƏBİƏT ELMLƏRİNİN ÖYRƏDİLMƏSİ ÜÇÜN İNFORMAL MÜHİTİN YARADILMASI

***Сабина Этибар гызы Бабаева***
*преподаватель кафедры Информатики и алгебры*
*Гянджинского Государственного Университета,*
*диссертант по программе доктора философии*

# СОЗДАНИЕ НЕФОРМАЛЬНОЙ СРЕДЫ ДЛЯ ИЗУЧЕНИЯ ЕСТЕСТВЕННЫХ НАУК В ВЫСШИХ УЧЕБНЫХ ЗАВЕДЕНИЯХ

***Sabina Etibar Babayeva***
*lecturer at the department of Computer science and algebra of Ganja State University*
*doctorial student in the program of doctor of philosophy*

# CREATION OF AN INFORMAL ENVIRONMENT FOR STUDYING NATURAL SCIENCES IN HIGHER EDUCATION INSTITUTIONS

**Xülasə.** Bu məqalədə araşdırılmalı əsas obyektləri aşağıdakı qısa fikir kimi yazmaq olar. Universitetdə müəllimlər yeni problemlərlə üzləşirlər. Bu problemlər öyrənmə mühitlərinin inkişafına daha çox təzyiq göstərir [11]. Bir çoxu yeni pedaqoji yanaşmaların tətbiqi, təhsil texnologiyasının sürətli inkişafı, çevik kurslara ehtiyacı olan qeyri-ənənəvi tələbə kütlələrinin şaxələndirilməsi cari və gələcək həyatında tələb olunan bacarıqlarla bağlı artan gözləntilərlə bağlıdır. Bu dəyişikliklər həm də təlimat paradiqmasından öyrənmə paradiqmasına keçid kimi təsvir edilən daha böyük transformasiyaya uyğunlaşır və ya biliklərin tələbələrə ötürülməsindən bilik konstruksiyasına keçid kimi qəbul oluna bilər.

Biz bu mühitin yaradılmasını məqalədə göstərməyə çalışmışıq.
***Açar sözlər:*** *informatika, təlim, tərbiyə, təhsil mühiti, universitet tələbələri*

**Аннотация.** Основные объекты исследования в данной статье можно сформулировать в виде следующей краткой идеи: преподаватели вузов сталкиваются с новыми проблемами, которые оказывают большее давление на развитие среды обучения [11]. Многие из них связаны с внедрением новых педагогических подходов, быстрым развитием образовательных технологий, диверсификацией нетрадиционных групп студентов, нуждающихся в гибких курсах, а также растущими ожиданиями относительно навыков, необходимых в их нынешней и будущей жизни. Эти изменения также согласуются с более масштабной трансформацией, описываемой как переход от парадигмы инструкции к парадигме обучения или может рассматриваться как переход от передачи знаний учащимся к построению знаний.

В статье мы постарались показать создание этой среды.
***Ключевые слова:*** *информатика, обучение, образование, образовательная среда, студенты вузов*

**Abstract.** The main objects of research in this article can be formulated in the form of the following brief idea: University teachers face new problems that put more pressure on the development of the learning environment [11]. Many of them are related to the introduction of new pedagogical approaches, the rapid development of educational technologies, the diversification of non-traditional groups of students in need of

flexible courses, as well as growing expectations about the skills needed in their current and future lives. These changes are also consistent with a larger transformation, described as a transition from the instruction paradigm to the learning paradigm, or can be seen as a transition from transferring knowledge to students to building knowledge.

In the article, we tried to show the creation of this environment.
***Keywords:*** *computer science, training, education, educational environment, university students*

**Giriş.** Zamanla İKT-nin inkişafı ilə yüksələn təhsil, daha çox tələbə mərkəzli tədris və öyrənmə təcrübələrinə keçid olmuşdur. Bu istinadlar nisbətən köhnə olsalar da, cari inkişaf məqsədləri ilə bağlı baxıldıqda onlar hələ də etibarlılığın itirməmişdir. Ali təhsil üçün illik hesabatlarına əsaslanaraq, fiziki mühitlər tələbələrin fəal rolunu vurğulayan bugünkü pedaqoji təcrübələrin ehtiyaclarını daha yaxşı qarşılaya bilmək üçün modifikasiya tələb edir[1]. Ənənəvi universitet mühazirə zalları nə müasir pedaqoji təcrübələrin, nə də müasir təlim texnologiyalarından səmərəli istifadənin tələbatına cavab vermək üçün təlim parametrlərini dəyişdirməyə imkan verir. Bundan əlavə, öyrənmə məqsədləri ilə bağlı yeni gözləntilər var. Öyrənilən ənənəvi məzmunla yanaşı, tələbələrin XXI əsr bacarıqları və ya indiki və gələcək iş mühitləri üçün bacarıqlar əldə etmələri gözlənilir [10]. XXI əsr bacarıqlarının bəzi nümunələrinə yaradıcı və tənqidi düşünmə, əməkdaşlıq və ünsiyyət bacarıqları, sosial mədəni səriştələr, İKT savadlılığı və problem həll etmə bacarıqları daxildir. Təhsil müəssisələri bu bacarıqları və onları dəstəkləyən tədris təcrübələrini öz kurikulum proqramına daxil etmələri vacibdir. Yenə də bu tədris təcrübələri tələbələrin İKT avadanlıqları ilə fəal iştirakını və ekspertlər komandası kimi öyrənmələrini təmin edən daha yaxşı öyrənmə mühitləri tələb edir. Bu fəaliyyətlər üçün auditoriyalarda tələbələrə məlumatların yayımlanması yaxşı seçim deyil. Ali təhsildə daha bir mühüm dəyişiklik informasiya kommunikasiya texnologiyalarından (İKT) istifadəni nəzərdə tutur. İKT və əlaqəli pedaqoji təcrübələrin inkişafı sürətlə baş verir. İKT XXI əsr bacarıqlarının mərkəzi elementidir və müasir tədris və təlim təcrübələrini dəstəkləmək üçün əsas vasitədir. İKT ali təhsilin daha çevik və geniş şəkildə əlçatan olmasında mühüm rol oynayır [8]. 2018 Horizon hesabatı ali təhsildə İKT sahəsində bir neçə inkişaf tendensiyasını, o cümlədən öyrənmə analitikası, adaptiv texnologiyalar və mobil öyrənməni göstərdi [5]. İKT-ni özündə birləşdirən ali təhsil yanaşmaları (məsələn, qarışıq öyrənmə, kütləvi açıq onlayn kurslar və onlayn video materiallarla çevrilmiş sinif strategiyaları) ali təhsildə öyrənmə təcrübələrini inkişaf etdirmək və ali təhsili daha çevik etmək üçün yeni yollar təqdim edir.

Universitetdə təhsil mühitinin inkişafı ali təhsillə bağlı gözləntiləri qarşılamaq və müasir texnologiya ilə müxtəlif pedaqoji yanaşmalardan istifadə etmək üçün açardır. Öyrənmə mühitlərini inkişaf etdirərkən tələbələrin perspektivləri nəzərə alınmalıdır [7]. Tələbələrin perspektivləri ali təhsildə keyfiyyətin təminatı və tədqiqata əsaslanan keyfiyyətin artırılması üçün də vacib hesab olunur. Hazırkı tədqiqatın məqsədi tələbələrin nöqteyi-nəzərindən ali təhsil səviyyəsi üçün ən yaxşı öyrənmə mühitini dərk etməklə onların üstünlük verdiyi öyrənmə mühitlərini müəyyən etmək idi.

**Nəzəri məlumat: öyrənmə mühiti.** Öyrənmə mühitinin bir neçə tərifi var. Ətraf mühitin müxtəlif elementlərini nəzərdən keçirmək üçün istifadə edilə bilən beş fərqli perspektivdən istifadə edərək, belə mühitləri müəyyənləşdirir: fiziki məkanlar, tədris və öyrənmə yanaşmaları, öyrənməyə dəstək verən sosial və əməkdaşlıq aspektləri, istifadə olunan texnologiyalar və məkandan kənarda kontekstli öyrənmə yerləri (məsələn, biologiya üzrə iş yerləri və sahə səfərləri) [9]. Belə mühitlərin layihələndirilməsi və qiymətləndirilməsi üçün Pedaqogika-Fəza-Texnologiya çərçivəsindən istifadə edərək öyrənmə mühitini müəyyən edir. Bu çərçivə fərdi (fərdi otaqlar) və ya şəbəkələr (öyrənmə məkanı) üçün istifadə olunan öyrənmə mühitlərini nəzərdən keçirərkən faydalı olan öyrənmə mühitinin müxtəlif elementləri arasında əlaqələri vurğulayır [9]. Qeyri-rəsmi öyrənmə mühitləri həm real, həm də virtual aləmlərdə sosial və ya fərdi təhsil fəaliyyətlərinin xeyrinə fərdi və kiçik qrupları dəstəkləyərkən vacibdir [5]. Bu, seminar otaqları və auditoriyalardan kənarda tədris mühitinin təmin edilməsinin vacibliyini göstərir. Bütün

öyrənmə ərazisi öyrənmə mərkəzləri kimi görünməlidir. Aşağıdakı bölmələrdə öyrənmə mühitlərinin xüsusiyyətləri verilən təriflərə uyğun olaraq müzakirə edilir. Tədris mühitləri üç daha böyük sahəyə (məkan, İKT, pedaqogika) bölünür, beləliklə, yuxarıda verilmiş öyrənmə mühitlərinin təsvirlərini əhatə edir. Pedaqogika texnologiya ilə genişləndirilir və fəza anlayışı imkan verir, pedaqogikanı və texnologiyanı özündə cəmləşdirir, texnologiya isə pedaqogikanı təkmilləşdirir və ya məkanı genişləndirir [9].

**Öyrədici məkan anlayışı.** Bu yaxınlarda fiziki məkanların əhəmiyyəti (məsələn, binalar, seminar və mühazirə otaqları) təhsil tədqiqat mühitində geniş şəkildə qəbul edilmişdir. Tədris və öyrənmə təcrübələrindəki dəyişikliklər yayım modelini dəstəkləyən və tələbələrin birgə biliklərin qurulması və ya birgə işi üçün yararsız olan ənənəvi öyrənmə məkanlarına (məsələn, mühazirə zalları) çüvirir. Carr and Fraser fiziki məkanlara aid inkişaf meyllərini təsvir edir [4]. Bu məkanlar İKT ilə müxtəlif pedaqoji yanaşmalardan istifadə etməyə, əməkdaşlıq və fəal təlim təcrübələrinin tətbiqinə və tələbələrin öz İKT cihazlarından istifadə etməyə imkan verir, eyni zamanda rahatdır və qeyri-rəsmi və getdikcə inteqrasiya olunmuş onlayn öyrənmə üçün məkanları ehtiva edir. Bugünkü öyrənmə məkanları kiçik qrup görüşlərini, layihə işlərini və dialoqları yerləşdirməyi bacarmalıdır [2]. Bundan əlavə, öyrənmə məkanlarında sənədləri göstərmək və onlarla işləmək üçün asanlıqla əldə edilə bilən texnologiyalar və alətlər olmalıdır. Bu məkanların rahatlığının, işıqlandırılmasının və akustikasının vacibliyini vurğulayır. Tələbələrin diqqətini təhsilə yönəldə biləcəyi rahat və sakit yerlər olmalıdır. Öyrənmə məkanından istifadənin öyrəgnmə tapşırıqlarından asılı olduğunu aşkar etdi; öz-özünə təhsil üçün tələbələr evdə təhsil almağı, daha çox əməkdaşlıq üçün isə universitet şəhərciyini seçirlər.

Öyrənmə məkanının dizaynı onun müəyyən bir şəkildə və ya xüsusi pedaqoji təcrübələrə uyğun istifadə olunmasını təmin etmir. Bununla belə fiziki məkanın çevikliyi müəllimlərin tədris üsullarına təsir edə bilər; daha çevik öyrədici məkanda olduqda, müəllimlər daha çox tələbə mərkəzli təcrübələrdən istifadəni vurğulayırlar. Məktəblərdə rifah və təhsilə müsbət təsir göstərən əlavə amillərə aşağıdakılar daxildir: bitki örtüyü, yumşaq mebel və aşağı oturacaq sıxlığı: daxili və xarici təmizlik məkan təhlükəsizliyi; keyfiyyətli qapalı hava və temperatur; akustika; təbii elementlər, məsələn, kənar görünüşlər və bitkilər [1].

**Ali təhsildə informasiya və kommunikasiya texnologiyaları.** Son onilliklərdə ali təhsildə tədris və təlimi dəstəkləmək üçün İKT-dən istifadə etməyə bir neçə fərqli yanaşma tətbiq edilmişdir. İKT-nin inkişafı sürətli olmuşdur, ali təhsillə bağlı Horizon Reports İKT-nin ali təhsildə indiki və gələcək tətbiqlərini təsvir edir [1]. Trendlər çox vaxt planşetlər, mobil telefonlar, geyilə bilən texnologiya və 3D çap kimi xüsusi texnologiyalar üzərində qurulur. Əsasən digər tendensiyalar daha çox pedaqoji yanaşmalara əsaslanır. Məsələn, dərsə aid texniki materiallarla təchiz edilmiş sinif otaqları, yaradıcı məkanlar, oyunlar və oyun metodları [1]. Bugünkü tendensiyaları mobil öyrənmə və analitik texnologiyalar kimi müəyyən etdi. Yaxın gələcəkdə qarışıq reallıq və süni intellektin. təhsildə daha mühüm rol oynayacağı və növbəti 4-5 il ərzində inkişaf tendensiyalarının öyrənməyə dəstək üçün blokçeyn və virtual köməkçilərə diqqət yetirəcəyi gözlənilir. Ali təhsildə İKT-nin əhatə etdiyi və müxtəlif texnoloji və pedaqoji yanaşmaları əhatə edən potensial geniş ərazini görmək olar.

Bu gün universitet səviyyəsində tədrisin mühüm aspekti tələbələrin şəxsi cihazlarından istifadədir. "Öz cihazınızı gətirin" yanaşmasının bir sıra üstünlükləri var, məsələn, universitetin müxtəlif məkanlar üçün cihazlar almasına ehtiyacı azaltmaq, bundan əlavə, qurğular artıq tələbələrə tanışdır və onların saxlanması tələbənin məsuliyyətidir. potensialını maksimum dərəcədə artırmaq üçün infrastruktur da dəyişdirilməlidir, yəni simsiz yerli şəbəkə (WLAN) və cihazların doldurulması üçün yerlər tələbələr üçün əlçatan olmalıdır, hansı ki,bu şərait ölkəmizdə çox az universitetlər təmin olunmuşdur.

Müxtəlif onlayn mühitlər eyni dərəcədə vacib rol oynamağa hazırdır. Bu mühitlərlə əlaqəli bəzi anlayışlara öyrənmə idarəetmə sistemləri, kurs idarəetmə sistemləri, virtual öyrənmə mühitləri və biliklərin idarə edilməsi sistemləri daxildir. Bunların hamısı az və ya çox sinonim kimi görünə bilər.

Tipik olaraq, bu anlayışlar tədris materiallarının çatdırılması, əməkdaşlıq sahələrinin yaradılması, müxtəlif tapşırıq və tapşırıqların di-

zaynı, tələbələrin işinin qiymətləndirilməsi, istifadəçi məlumatlarının toplanması və idarə edilməsi üçün alətləri ehtiva edən onlayn mühitlərə (məsələn, Moodle) aiddir. Bundan əlavə, müxtəlif bulud hesablama xidmətləri ali təhsil pilləsində də özünü qabarıq göstərir.

**Ali təhsildə pedaqoji hissə.** Son bir neçə onillikdə pedaqoji təcrübələrdə biliyin ötürülməsindən biliyin qurulmasına keçid baş vermişdir. Transmissiya modeli məzmunun eyni vaxtda çoxlu sayda tələbəyə paylana biləcəyi böyük mühazirə zallarında aparılan ali təhsil üçün çox uyğundur. Daha yeni baxışlar öyrətmə və öyrənməni daha fəal tələbə iştirakı və daha çox əməkdaşlıq fəaliyyəti ilə biliyin qurulması prosesi kimi şərh edilir [6]. Ümumiyyətlə, son illərdə ali təhsildə pedaqogikanın rolu daha çox vurğulanır. Ali təhsildə peşəkar hazırlıq, hətta tədris tapşırıqları üçün də əvvəllər ciddi şəkildə intizam əsasında idi. İndi pedaqogikanın roluna daha çox diqqət yetirilir. Bunu kurikulum sisteminin məktəblərə inteqrasiyası kimi vurğulamaq olar.

Təlim və öyrənmənin daha çox tələbə mərkəzli üsullarını inkişaf etdirmək üçün bir neçə yanaşma və model təqdim edilmişdir. Məsələn, qarışıq öyrənmə həm onlayn, həm də üzüzə formatları qarışdırmaqla və tələbələrə vaxt və məkandan çevik istifadə etməyə imkan verməklə tələbələr üçün vahid öyrənmə təcrübəsini əhatə edir. Qarışıq öyrənmə nümunələrindən biri, üzbəüz görüşdən əvvəl tələbələrin öyrənmələri üçün mühazirələrin video materiallar və digər materiallarla əvəz edildiyi tərs çevrilmiş sinif yanaşmasıdır, hansı ki, bu metod özünü pandemiya zamanı doğrultdu.

**Tədqiqat məqsədləri.** Tələbələr və müəllimlər ənənəvi olaraq ali təhsil üçün təlim mühitinin layihələndirilməsində çox kiçik rol oynamışlar. Eynilə, ədəbiyyat öyrənmə mühitlərinin tələbələrin nöqteyi-nəzərindən dərk edilməli və qiymətləndirilməli olduğunu öyrənmə mühiti ilə bağlı daha çox tələbənin perspektivlərinə ehtiyac olduğunu təklif edir. Hazırkı məqalə tələbələrin ali təhsil pilləsindəki təhsil mühitləri, o cümlədən hazırda təhsil aldıqları tədris mühitləri və hansı növ öyrənmə mühitlərinə üstünlük verdikləri barədə təsəvvürlərinə diqqət yetirməklə bu tədqiqat boşluğunu doldurur.

Bu məqsədlərə nail olmaq üçün tədqiqat sualları aşağıdakı kimi idi:

1. Fiziki təlim məkanları, təhsildə İKT və pedaqogika nöqteyi-nəzərindən tələbələr öz təlim mühitlərini necə qiymətləndirirlər?

2. Tələbələr hansı növ öyrənmə mühitlərinə üstünlük verirlər və onların nöqteyi-nəzərindən ali təhsil üçün ən yaxşı öyrənmə mühiti hansıdır?

Bu tədqiqatda biz qarışıq metodlu yanaşmadan istifadə etdik: birincisi, biz tələbələrin öyrənmə mühitlərinin ölçüləri ilə bağlı kəmiyyət maddələrinə cavablarını təhlil etdik; düşündüklərini təsvir edən açıq cavablar əsasında keyfiyyətli məlumatları təhlil etdik.

**Metodlar.** Tədqiqat məlumatları tədris və öyrənmə təcrübələrinin inkişafına güclü diqqət yetirir. Bu inkişafda istifadə olunan pedaqoji təcrübələrə, daha çox tələbə mərkəzli yanaşmalara və öyrənmə mühitlərinin inkişafına diqqət yetirilir. Tədris mühitləri ənənəvi mühazirə zallarından tutmuş daha çevik sinif otaqlarına və ən son İKT vasitələri ilə təchiz olunmuş laboratoriyalara qədər dəyişir. Sorğunun məqsədi artıq universitetdə təhsil təcrübəsi olan tələbələri əhatə etmək idi. Nəticədə üçüncü kurs tələbələri hədəf qrup kimi seçilib. Dörd fakültədən ümumilikdə 73 tələbə (66% qadınlar) strukturlaşdırılmış və açıq suallardan ibarət sorğuya cavab verib. Materiallar əsasən müxtəlif kursların, məsələn, mühazirələrin təmas dövrlərində toplanmışdır. Müxtəlif kursların müəllimləri vasitəsilə tələbələrə sorğu haqqında elektron poçt və məktəbin elektron lövhələri vasitəsilə də məlumat verilib. Anket həm elektron, həm də kağız formatda mövcud idi, çünki müxtəlif şöbələr sorğunun təşkili üçün müxtəlif strategiyalara üstünlük verirdilər. İştirak könüllü idi və respondentlər sorğu, məlumatların necə təhlil ediləcəyi, onun məqsədləri və nəticələrin necə paylanacağı barədə yaxşı məlumatlı idilər. Respondentlərin hamısı böyüklər idi.

Daha əvvəl qeyd edildiyi kimi, bu tədqiqat qarışıq metodlu bir yanaşma əsasında aparılmışdır[12]. Tələbələrin mövcud təlim mühiti haqqında təsəvvürlərinin ümumi mənzərəsini təmin etmək üçün kəmiyyət məlumatları toplanmışdır. Bu cür məlumatlar üç perspektivə yönəldilib: fiziki təlim mühitləri, istifadə olunan İKT və pedaqoji təcrübələr (Nəticələr bölməsindəki ifadələr). Bu bölmədə bütün 73 tələbənin məlumatları var idi (çatışmayan məlumatlar istisna edil-

mişdir). Alət bu tədqiqat üçün Radcliffe və Manninenin komandası tərəfindən verilən öyrənmə mühiti təriflərinə əsaslanaraq hazırlanmışdır [3]. Alət tələbənin hazırkı öyrənmə mühiti ilə bağlı qavrayışlarına ümumi baxış əldə etmək üçün hazırlanmışdır. Keyfiyyət metodlarından istifadə etməklə aparılan bölmə üçün təsviri fon yaratmaq üçün kəmiyyət məlumatları yalnız təsviri statistikadan (orta qiymətlər və standart kənarlaşmalar) istifadə edilməklə təhlil edilmişdir.

Eyni zamanda, keyfiyyət göstəriciləri 23 tələbənin açıq suallarına cavabları ehtiva edir. Bu məlumatlar yaxşı öyrənmə mühitinin nəyin təşkil etdiyinə dair tələbə qavrayışlarından ibarət idi. Şagirdlərə ümumi suallar verilib və onlara təlim mühitinin spesifik aspektləri qeyd olunmayıb. Cavab verən tələbələr vacib hesab etdikləri şeylərə uyğun olaraq öyrənmə mühitləri ilə bağlı sahələri və perspektivləri təyin edə bildilər. Sual belə idi: "Məqsəd ali təhsil səviyyəsində ən yaxşı təhsil mühitini müəyyən etməkdir. Bu öyrənmə mühiti necə olardı və buna necə nail olmaq olar?" Keyfiyyətli məlumatların təhlili, o cümlədən kod kitabının hazırlanması, bu məqalənin üç müəllifi tərəfindən mərhələlərlə aparılmışdır. Təhlilin birinci mərhələsində respondentlərin qaldırdığı mövzular haqqında ümumi məlumat əldə etmək məqsədi ilə tələbələrin açıq cavabları tədqiqatçılar tərəfindən oxunmuşdur.

**Nəticələr.** Biz ilk növbədə tələbələrin fiziki öyrənmə məkanları, İKT resursları və pedaqoji təcrübələrlə bağlı təcrübələrini təsvir etmək üçün kəmiyyət məlumatlarının təsviri statistikasını təqdim edirik. Daha sonra tələbələrin açıq cavablarında müəyyən edilmiş beş əsas kateqoriyanı təsvir edirik. Nəhayət, hər bir kateqoriyanın və alt-kateqoriyanın qeyd olunma tezliyi müzakirə olundu.

**Problemin aktuallığı.** Tələbələrin təlim fəaliyyəti motivasiyasında səriştəli müəllimin nəzəri hazırlığı, onun analitik, elektron və, proqnostik və onun öyrənmə şəraitindən, yerindən asılı olmayaraq bu məqaləni actual mövzu kimi ortaya qoyur. Layihələşdirici təlim proqramları vasitəsilə bu aktual məsələ Ali məktəb tələbələri üçün yenidir.

**Problemin elmi yeniliyi.** Motivasiyaedici orta məktəb kurikulum sistemindən sonra ali məktəblərdə də davamedici bir sistem kimi bu məqalənin elmi yeniliyini nəticəlilik olaraq vurğulamaq olar.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali məktəb tələbələri və müəllimlər yararlana bilərlər.

**Ədəbiyyat:**


1. https://www.nrdc.org/sites/default/files/nrdc-sign-on-letter-to-nas-iris_2018-01-30.pdf
2. Palmer, M.M. Next Generation @ IUPUI: A leadership development program for faculty of color / M.M.Palmer, J.V.Banks, J.S.Smith [et al.] // To Improve the Academy, - 2011. №30, -s. 203-215.
3. Tanner, C.K. Effects of school design on student outcomes // Journal of Educational Administration, -2009. 47(3), -s.381–399.
4. Carr, N., Fraser, K. Factors that shape pedagogical practices in next generation learning spaces. In The future of learning and teaching in next generation learning spaces.// Emerald Group Publishing Limited.- 2014. -pp. 175-198.
5. https://library.educause.edu/~/media/files/library/2018/8/2018horizonreport.pdf
6. Al-Samarraie, Hosam; Shamsuddin, Aizat; Alzahrani, Ahmed Ibrahim. Educational Technology Research and Development // -2020. v.68 №3, -p.1017-1051.
7. Newton, Lynn D., and Douglas, P.Newton. Creativity in 21 st-century education // Prospects, -2014. 44, -p. 575-589.
8. Voogt, J. Under which conditions does ICT have a positive effect on teaching and learning? A call to action / J.Voogt, G.Knezek, M. Cox [et al.] // Journal of computer assisted learning, -2013. 29(1), -p.4-14.
9. Manciaracina, Andrea Giuseppe. Relation among pedagogy, space and technology and users. An implementation of Radcliffe's PST framework. // In: Edulearn19 Proceedings. IATED, -2019. -p. 3067-3073.
10. Dina Shouman, Amani Itani and Anwar Kawtharani. Preparing Students with Twenty First Century Skills for the Future Post-Pandemic Era // Submitted: -25 May, -2023. Reviewed: -27 May, -2023 Published: -18 August, -2023. DOI: 10.5772/intechopen.1001993
11. www.wellcome.ac.uk/stellent/groups/corporatesite/@msh_peda/documents/web_document/WTP055240.pdf
12. https://cumming.ucalgary.ca/sites/default/files/teams/82/communications/Creswell%202003%20-%20Research%20Design%20-%20Qualitative%2C%20Quantitative%20and%20Mixed%20Methods.pdf

# *ALİ TƏHSİLİN PROBLEMLƏRİ*
# *ПРОБЛЕМЫ ВЫСШЕГО ОБРАЗОВАНИЯ*
# *PROBLEMS OF HIGHER EDUCATION*

*UOT 378*

***Kamal Sərvər oğlu Kamalov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialının*
*Hunanitar elmlər kafedrasının baş müəllimi*
*https://orcid.org/0009-0003-9376-1502*
https://doi.org/10.69682/arti.2024.91(4).42-44

## AZƏRBAYCANDA "SOSİAL İŞ" İXTİSASI ÜZRƏ KADR HAZIRLIĞININ AKTUAL PROBLEMLƏRİ

***Камал Сарвар оглы Камалов***
*старший преподаватель кафедры Гуманитарных наук*
*Губинского филиала Азербайджанского Государственного Педагогического Университета*

## АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ ПОДГОТОВКИ КАДРОВ ПО СПЕЦИАЛЬНОСТИ «СОЦИАЛЬНАЯ РАБОТА» В АЗЕРБАЙДЖАНЕ

***Kamal Sarvar Kamalov***
*head teacher of Humanites department at*
*Guba branch of Azerbaijan State Pedagogical University*

## STAFF TRAINING ON THE SPECIALIZATION OF "SOCIAL WORK" IN AZERBAIJAN CURRENT PROBLEMS

**Xülasə.** Ötən əsrin sonlarında müstəqillik əldə etmiş respublikamızda sosial problemlərin həlli, insanların rifah halının yüksəldilməsi Azərbaycanın gələcək inkişafını şərtləndirən əsas şərtlərdən biri olmuşdur. Bunun üçün, ilk növbədə, bu problemlərin öhdəsindən gələ biləcək yeni və ixtisaslı mütəxəssislərə böyük ehtiyac var idi. Ona görə də ilk növbədə bu mütəxəssislərin yetişdirildiyi ali məktəblərdə tədrisin təşkilinə xüsusi diqqət yetirilməlidir. Ötən müddət ərzində bu sahədə müəyyən işlər görülsə də, əldə olunan təcrübəni qənaətbəxş hesab edə bilmərik. Məqalədə bu kimi zəruri məsələlərə toxunulur və hələ də mövcud olan çətinliklərin həm nəzəri, həm də praktiki cəhətdən həlli üçün tövsiyələr verilir.
***Açar sözlər:*** *təhsil, idarəetmə, metod, problem, sosiallaşma, əhali, dərslik, sosial işçi, müasir*

**Аннотация.** Решение социальных проблем и повышение благосостояния людей в нашей республике, получившей независимость в конце прошлого века, были одними из основных условий, определяющих будущее развитие Азербайджана. Для этого, прежде всего, возникла большая потребность в новых и квалифицированных специалистах, которые могли бы заняться решением этих проблем. Поэтому, прежде всего, особое внимание следует уделить организации преподавания в вузах, где готовят этих специалистов. Хотя за прошедший период в этой области была проделана определенная работа, мы не можем считать полученный опыт удовлетворительным.

В статье рассматриваются столь важные вопросы и даются рекомендации как по теоретическому, так и по практическому решению проблем, которые все еще существуют.
***Ключевые слова:*** *образование, менеджмент, метод, проблема, социализация, население, учебник, социальный работник, современный*

**Abstract.** Solving social problems and improving people's well-being in our republic, which gained independence at the end of the last century, were among the main conditions determining the future

development of Azerbaijan. For this, first of all, there was a great need for new and skilled specialists who could deal with those problems. The initiation of personnel training in the field of social work in higher schools was intended to solve such problems. The refore, first of all, special attention should be paid to the organization of teaching in higher schools where these specialists are trained. Although some work has been done in this field in the past period, we cannot consider the experience gained as satisfactory. The article addresses such important issues and provides recommendations for both theoretical and practical solutions to problems that still exist.

***Keywords:*** *education, management, method, problem, socialization, population, textbook, social worker, modern*

XX əsrin sonlarında müstəqillik əldə edən Azərbaycanın qarşısında duran başlıca məsələlərdən biri də ölkə əhalisinin sosial rifah halını yaxşılaşdırmaq, sosial müdafiəyə ehtiyacı olan əhali qruplarının ehtiyaclarını diqqətdə saxlamaq, ümumilikdə insanların sosial problemlərinin həlli istiqamətində təcili, həm də konkret tədbirlər görməkdən ibarət idi. Bu isə heç də asan deyildi. Bir tərəfdən bu problemləri həll edəcək idarəetmə strukturunun milli maraqlara uyğun formalaşmaması, bir tərəfdən yeni idarəçilik metodlarına cavab verə biləcək yerli kadrların olmaması, digər tərəfdən isə yaxın gələcəkdə bu istiqamətdə çalışacaq və nəhayət, müasir tələblərə cavab verə biləcək kadr hazırlığının olmaması problemləri birə-beş artırırdı. Bunlar isə digər sahələrdə olduğu kimi, əhaliyə sosial xidmət istiqamətində daha açıq-aydın hiss olunurdu. Açıq etiraf etmək lazımdır ki, əksər respublikalardan fərqli olaraq, Azərbaycanda sosial iş sahəsi üzrə kadr hazırlığı prosesi ləngiyirdi. Nəhayət, 2005-ci ildə respublikamızda ilk dəfə Bakı Dövlət Universitetində, özü də yalnız magistratura pilləsində sosial iş ixtisası üzrə kadr hazırlığına başlanıldı.

Etiraf edək ki, sosial iş ixtisası üzrə kadr hazırlığı hər bir dövrün real və zəruri məsələsi olmalıdır. Keçmiş SSRİ məkanında bu istiqamətdə kadr hazırlığına o qədər ciddi yanaşılmayıb. Elə bunun nəticəsidir ki, həmin sahədə işləyənlər də əvvəllər müxtəlif xidmət sahələrində çalışanlar və bəzən sosial peşə ilə heç də bağlılığı olmayan insanlar olub. Məhz yeni şəraitə uyğun kadr hazırlığı zamanı da məhz bu amil əsas götürülmüşdü. Amma ölkədə nəinki sosial işçilərin vəzifələri və sosial xidmətlərin funksiyaları, heç bu sahə üzrə kadr hazırlığının aparıldığı haqda yetərincə məlumat yox idi. Ali məktəblərə qəbul imtahanlarının nəticələrinə əsasən bu ixtisaslara qəbul olunanların sabah taleləri necə olacağı elə onların özü üçün də qaranlıq qalmışdı.

Heç kimə sirr deyil ki, ali təhsil müəssisələri həmin dövrdə heç də az problemlərlə üz-üzə qalmadılar. Cəmiyyətin bu haqda məlumatsızlığı elə ali məktəbdə dərs deyən müəllimlərdən də yan keçmədi. Gələcək sosial işçiləri yetişdirəcək, ölkəyə insanların sosial müdafiə sahəsindəki problemlərini müəyyənləşdirəcək və aradan qaldıra biləcək kadrların hazırlanması işi bəzən elə bu sahədən az-çox xəbəri olan pedaqoqlara tapşırıldı. Zaman keçdikcə, həmin təsadüfi pedaqoqları sosioloqlar, psixoloqlar, daha təcrübəli sosial işçilər əvəz etdikcə, bu sahədəki boşluqlar aradan qaldırıldı. Amma elmi-metodiki cəhətdən mövcud vəziyyəti qənaətbəxş hesab etmək olardımı? Dərslik və dərs vəsaitlərinin olmaması, fənn proqramlarının ölkə reallıqlarının nəzərə almadan hazırlanması zamanı bəzən milli maraqlar və xüsusiyyətlər nəzərə alınmamışdı.

Hazırda Azərbaycanda 20-ə yaxın ali məktəbdə və bir onun yarısı qədər də orta ixtisas təhsili müəssisəsində “Sosial iş” ixtisası üzrə kadrlar hazırlanır. Sevindiricidir ki, bu ali məktəblərin bir qismi gələcək sosial işçilərin zəruri tələblərə cavab verən səviyyədə hazırlanması sahəsində kifayət qədər təcrübə qazanmışlar. Bakı Dövlət Universiteti, Azərbaycan Dövlət Pedaqoji Universiteti və onun filialları (Quba və Şəki), Azərbaycan Dövlət İqtasad Universiteti, Azərbaycan Universiteti, Azərbaycan Əmək və Sosial Münasibətlər Akademiyası kimi ali məktəblərin bu yönümdə fəaliyəti və tədrisin təşkili vəziyyəti yalnız yüksək dəyərləndirilməlidir. Ümumilikdə, günümüzün tələblərinə cavab verən təhsil prosesi ilə yanaşı, bu ali məktəblərdə sosial iş ixtisası üzrə kadr hazırlığı ilə bağlı aparılan və keçirilən tədbirləri yalnız alqışlamaq olar. Amma bütün bunlara baxmayaraq, bu gün ölkəmizdə həmin ixtisaslar üzrə təhsil alan tələ-

bələrin təminatını ödəyəcək və müasir tələblərə cavab verə biləcək elmi-metodik ədəbiyyatlar hələ də yetərincə deyil. Bəzən tədris prosesini həyata keçirən müəllimlər bu səbəbdən xarici dərsliklərə mürüciət etməli olurlar. Eyni fənn üzrə müxtəlif ali məktəblərdə hazırlanan fənn proqramları da bir-birindən gərqlidir. Bu da həmin fənnləri tədris edən müəllimlərin bəzən bu sahə üzrə mütəxəssis olamaması və belə bir vacib məsələyə subyektiv yanaşmasından irəli gəlir. Bəzi ali məktəblərdə bu ixtisas üzrə hələ ilk məzun buraxılışının olmaması onların son kursda harada istehsalat təzrübəsi keçəcəyi və bu kimi aktual bir məsələnin necə təşkil olunacağı ilə bağlı maraqlı suallar ortaya çıxarır. Tələbələrin xarici ölkələrin ali məktəblərinin uyğun təhsil ocaqları ilə əməkdaşlığı – qarşılıqlı təcrübənin öyrənilməsi, tələbə mübadiləsi, birgə tədbirlərin təşkili də ümumi işə yalnız müsbət təsir göstərə bilər. Bütün bu və digər bu kimi sual doğuran məqamları ümumiləşdirərək təklif etmək istərdim ki, 2-ci kursdan başlayaraq, gələcək sosial işçilərin ixtisaslaşması prosesi təşkil olunsun. Konkret olaraq, onların çətin həyat şəraitində yaşayan hansı əhali kateqoriyaları ilə işləyəcəyi elə tələbəlik illərindən müəyyənləşməlidir və gələcəkdə əlillərlə, valideynlərini itirmiş uşaqlarla, ahıllarla, penitensiar müəssisələrsən cəza çəkməkdən azad edilmiş və cəmiyyətə adaptasiyada hələ də problemləri olan və s. bu kimi sosial müdafiəyə daha çox ehtiyac duyulan adamlarla ünsiyyətdə olacaq bu günün tələbəsi – sabahın sosial işçisi indidən özünü olduqca məsuliyyətli bir prorsesə hazırlamalıdır. Çünki belə insanlarla işləməmək heç də asan deyil. Ona görə də gələcək mütəxəssislər sabahın həkimləri kimi bu məsuliyyəti dərk etməli və özlərini bu prosesə hazırlamalı, bir sözlə təcrübə toplamalıdırlar. Digər ən vacib məsələ isə cəmiyyətin özündə geniş maarifləndirmə işlərinin aparılması və bu işdə elə tələbələrin də iştirakı təmin edilməsidir. Bu həm də gələcək sosial işçiləri öz peşələrinə daha məsuliyyətlə yanaşmağa sövq edər. Onlar bir daha dərk edərlər ki, ailə üzvlərindən, qohumlarından, hətta ən yaxın adamlarından doğmalıq hiss etməyən insanların onların mənəvi yardımına daha çox ehtiyacı var.

**Problemin aktuallığı.** XXI əsrin əvvəllərindən etibarən respublikamızda elm və təhsil sahəsində aktual məsələlərdən biri də yeni yaradılmış "Sosial iş" ixtisası üzrə kadr hazırlığı ilə bağlıdır. Artıq 20 ilə yaxındır ki, bu sahədə mütəxəssis hazırlığı həyata keçirildə də, hələ də görülən tədbirləri yetərli saymaq olmaz. Gələcək sosial işçilərin ali məktəblərdə bacarıqlı və yüksək savada malik mütəxəssis kimi hazırlanmasından başlayaraq onların gənc kadr kimi işlə təminatınadək olan məsələlərdə hələ də müəyyən qədər problemlər var ki, həmin məsələlərin də araşdırılması baxımından məqaləni aktual hesab etmək olar.

**Problemin yeniliyi.** "Sosial iş" ixtisası üzrə kadr hazırlığında hələ də mövcud olan halların aradan qaldırılması məqsədi ilə irəli sürülən təklif və tövsiyələr problemin elmi yeniliyini şərtləndirir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərində "Sosial iş" ixtisası üzrə fənnləri tədris edən və çalışan müəllimlər, metodistlər, təhsil alan tələbələr, eləcə də bu sahədə işləyən mütəxəssislər yararlana bilərlər.

**Ədəbiyyat:**


1. Qəhrəmanov E.Ə., Əhmədov Y.P. Sosial işin əsasları. / Dərs vəsaiti. – Bakı: "B-print", 2014.
2. Əhmdov Y.P. Sosial işin nəzəriyyəsi və təcrübəsi. / Ali məktəblər üçün dərslik. – Bakı: PG Nəşrlər Evi, - 2013.
3. Məmmədova R.O. Sosial işə giriş. / Ali məktəblər üçün dərslik. - Bakı, - 2019.
4. Firsov M.V., Studenova E.Q. Sosial işin nəzəriyyəsi. / Ali məktəblər üçün dərslik. - Bakı, - 2018.



**E-mail:** kamalsarvar@gmail.com


**Redaksiyaya daxil olub:** 13.05.2024

*UOT 372.3/.4*

***Pərvanə İldırım qızı İmanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
https://orcid.org/0000-0002-9542-4804
https://doi.org/10.69682/arti.2024.91(4).45-50

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARDA ÜNSİYYƏT MƏDƏNİYYƏTİNİN İNKİŞAFININ NƏZƏRİ ASPEKTLƏRİ

***Парвана Ильдырым гызы Иманова***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# ТЕОРЕТИЧЕСКИЕ АСПЕКТЫ РАЗВИТИЯ СОЦИАЛЬНОЙ КУЛЬТУРЫ У ДЕТЕЙ ДОШКОЛЬНОГО ВОЗРАСТА

***Parvana Ildirim Imanova***
*teacher at Azerbaijan State Pedagogical University*

# THEORETICAL ASPECTS OF SOCIAL CULTURE DEVELOPMENT IN PRE-SCHOOL CHILDREN

**Xülasə.** Elmi məqalədə məktəbəqədər yaşlı uşaqlarda ünsiyyət mədəniyyətinin inkişafının nəzəri aspektləri araşdırılmışdır. Bir insanın cəmiyyətdəki uğurunun, xüsusilə sosiallaşmasının digər amillərlə yanaşı ünsiyyət mədəniyyətinin səviyyəsindən asılı olduğu, cəmiyyətdəki hər hansı bir fəaliyyətin səmərəliliyinə əhəmiyyətli dərəcədə təsir göstərməsi əsaslandırılmışdır.
***Açar sözlər:*** *məktəbəqədər yaş, ünsiyyət mədəniyyəti, tərbiyəçi-müəllim, pedaqoji etika, pedaqoji takt*

**Аннотация.** В научной статье исследованы теоретические аспекты развития культуры общения у дошкольников. Обосновано, что успешность человека в обществе, особенно его социализация, зависит, среди прочих факторов, от уровня культуры общения и оказывает существенное влияние на эффективность любой деятельности в обществе.
***Ключевые слова:*** *дошкольный возраст, культура общения, учитель-воспитатель, педагогическая этика, педагогический такт*

**Abstract.** Theoretical aspects of the development of the culture of communication among preschoolers are investigated in the scientific article. It is justified that the success of a person in society, especially his socialization, depends, among other factors, on the level of culture of communication and has a significant impact on the effectiveness of any activity in society.

***Keywords:*** *preschool age, communication culture, educator-teacher, pedagogical ethics, pedagogical tact*

Hal-hazırda "mədəniyyət" anlayışı insanların həyat və fəaliyyətinin təşkilinin müxtəlif növlərində və formalarında, habelə maddi və mənəvi dəyərlərdə ifadə olunan cəmiyyətin tarixən müəyyən bir inkişaf səviyyəsini, insanın yaradıcı güc və qabiliyyətlərini ifadə edir.

Mədəniyyət insanlardan kənarda mövcud deyil, o, ilkin olaraq insanla bağlıdır və onun daim öz həyatının və fəaliyyətinin mənasını axtarmağa, özünü və yaşadığı dünyanı təkmilləşdirməyə çalışması ilə yaranır.

Mədəniyyətin mənimsənilməsində, onun nəsildən-nəslə ötürülməsi prosesində təlim-tərbiyənin, təhsilin əvəzedilməz rolu vardır. Ənənələrin yaşadılması, təkmilləşdirilməsi və ötürülməsi sayəsində insan özündən əvvəl yaranmış mədəniyyətə yiyələnir.

İnsanlar arasında qarşılıqlı anlaşmanın mürəkkəb sosial-psixoloji prosesi olan ünsiyyət şəxsiyyətin inkişafında həlledici rol oynayır. Ünsiyyət olmadan tam hüquqlu şəxsiyyətin formalaşması ümumiyyətlə mümkün deyil. Məhz ünsiyyət prosesində təcrübənin mənimsənilməsi, biliklərin toplanması, praktiki bacarıqların, münasibət və inancların formalaşması baş verir. Yalnız ünsiyyət zamanı estetik hisslər formalaşır, mənəvi ehtiyaclar inkişaf edir, xarakter formalaşır.

L.D. Stolyarenko "ünsiyyət" anlayışının aşağıdakı tərifini verir: "Ünsiyyət insanların cəmiyyətin bir üzvü kimi digər insanlarla qarşılıqlı əlaqəsinin spesifik formasıdır; insanlar arasında sosial münasibətlər ünsiyyətdə həyata keçirilir. Ünsiyyət insanlar, sosial qruplar, icmalar arasında məlumat, təcrübə, bacarıq və fəaliyyət nəticələrinin mübadiləsinin aparıldığı qarşılıqlı əlaqə prosesidir" [7, s. 3].

Tərbiyəçi-müəllimin peşə fəaliyyətinə şəxsi hazırlığı onun ümumi və pedaqoji mədəniyyət səviyyəsindən asılı olur. V.S. Qrexnev, pedaqoji ünsiyyət mədəniyyətinə böyük əhəmiyyət verərək, tərbiyəçi-müəllimlə onun ümumi mədəniyyəti arasında ünsiyyət mədəniyyətini müəyyən edir: "İnsanın mədəniyyəti nə qədər yüksəkdirsə, o, ünsiyyətin məzmununa və təbiətinə bir o qədər təsir göstərir" [4, s.34]. Fəaliyyətinin əsasını insanı formalaşdırmağa, təkmilləşdirməyə yönəltmiş tərbiyəçi-müəllim uşaqları ruhlandıran və həvəsləndirən mədəniyyət obrazını təcəssüm etdirməlidir. Buna görə də pedaqoji ünsiyyət mədəniyyəti yalnız pedaqoji ünsiyyətin deyil, həm də vahid pedaqoji prosesin səmərəli təşkilinin tərkib hissələrindən biri kimi özünü əks etdirir.

Pedaqoji ünsiyyət mədəniyyəti nitqdə, davranışda, jestlərdə, mənəvi-əxlaqi dəyərlərdə ifadə olunan pedaqoji mədəniyyətin bir hissəsi hesab olunur. Məktəbəqədər təhsil müəssisəsində uşaqlara bütün etiket, ünsiyyət qaydaları dərin humanist məzmunla aşılanmalıdır. Pedaqoji ünsiyyət mədəniyyəti uşaqlarda hörmət, xoşməramlılıq və tolerantlıq kimi xarakterik xüsusiyyətləri formalaşdırmaqla yanaşı, nəzakətli və təvazökar davranmağın inkişafını da nəzərdə tutur. Məktəbəqədər yaşlı uşaq üçün onun başqa insanlarla ünsiyyəti təkcə müxtəlif təcrübələr mənbəyi deyil, həm də onun şəxsiyyətinin formalaşması, inkişafı üçün əsas şərtdir [6, s. 29], buna görə də ünsiyyət mədəniyyətinin formalaşdırılması bu baxımdan son dərəcə vacibdir. Nəzakət həqiqi ünsiyyət istedadı kimi qəbul edilir, əsas məzmunu isə qarşılıqlı ünsiyyətin müxtəlif vəziyyətlərində müəyyən davranış qaydalarına riayət etməkdən ibarət olur.

Təvazökarlıq- insanlara qarşı hörmət və həssaslıqla yanaşmada, özünə qarşı yüksək tələblərdə müşayiət olunur. Təvazökarlıq şəxsiyyətin əxlaqi xüsusiyyətidir, əsl gözəl davranışın göstəricisidir. Mədəni ünsiyyətin vacib cəhəti digər insanlarla qərəzsiz ünsiyyət qurmaq bacarığıdır, öz zövqlərini və baxışlarını tətbiq etmək deyil. Pedaqoji ünsiyyət mədəniyyətində zəriflik və öncədən düşünmə, planlaşdırma kimi tərbiyəçi-müəllimə məxsus keyfiyyətlərin olması böyük əhəmiyyət kəsb edir. Pedaqoji ünsiyyət prosesində təhsilalanlarla təhsilverənlərin bir-birini qavraması və anlaması, birinin digərinə təsir göstərməsi və kommunukativ - əlaqə funksiyasına malik olması müəllimin peşəkar fəaliyyətində ən başlıca yerlərdən birini tutur [3, s. 154].

Pedaqoji ünsiyyət etikası və pedaqoji taktika pedaqoji ünsiyyət mədəniyyətinin tərkib hissəsidir.

Etika (yunan dilindən "ethos" – adət, rəftar) – əxlaq təlimi mənasını ifadə edir. "Etika" termini ilk dəfə Aristotel tərəfindən düzgün, əxlaqi hərəkətləri yerinə yetirmək üçün nə etməli olduğumuz sualına cavab verməli olan praktik fəlsəfəni ifadə etmək üçün istifadə edilmişdir. Əxlaq insan tərəfindən tanınan etik dəyərlər sistemidir. Əxlaq ictimai həyatın müxtəlif sahələrində: ailədə, məişətdə, siyasətdə, elmdə, təhsil prosesində insanların sosial münasibətlərinin, ünsiyyətinin və davranışının normativ tənzimlənməsinin ən mühüm yoludur.

Etikanın ən mühüm kateqoriyaları bunlardır:

"yaxşı", "pis", "ədalət", "məsuliyyət", "vəzifə", "vicdan".

Əxlaq normaları öz ideoloji ifadəsini insanın davranış mədəniyyətinə aid ümumi fikirlərdə, əmrlərdə və prinsiplərdə alır. Əxlaq həmişə

Həqiqət və ədalət carçısı olan xalq öz idealının bütövlük və qüdrətini daha əzəmətli və qabarıq vermək üçün onun düşmənlərini də döyüşkən, mübariz və güclü təsvir edir. Koroğlu Ərəb Reyhanı tanıyırdı. Onunla üz-üzə gəlməsə də, bu haqda çox eşitmişdir. Bilirdi ki, o, güclü, qüdrətli, igid bir adamdır. Azərbaycan xalqının əfsanəvi qəhrəmanı Koroğlu V sinfin "Ata yurdu", VIII sinfin "Azərbaycan tarixi" dərsliklərində Cəlalilər hərəkatı, "Koroğlu" mətnləri sözügedən problemə həsr olunmuşdur. Dastanda cəsarətlilikləri, cəsurluqları ilə seçilən igidlər Koroğludan heç də geri qalmırlar. Qəhrəmanların qələbə və hünəri bir neçə amillə bağlıdır. Bunlardan biri fiziki güc və mənəvi-əxlaqi kamillikdir. Koroğlunun Qarsa səfəri ilə bağlı hissəsində oxuyuruq ki, Koroğlu Dəli Həsənlə ilk dəfə qarşılaşır, onu sazla-sözlə başa salmağa çalışır. Bu mümkün olmadıqda fiziki gücünü göstərməli olur. Onlar misilsiz ustalıqla qurşaq yapışırlar. İntəhasız cəsur igidlər sonradan məslək və əqidə qardaşına çevrilirlər. Tədqiqat baxımından maraq doğuran cəhətlərdən biri də budur ki, dastan qəhrəmanlıqları xalqın ictimai tələb və milli mənafeyinə, mentalitetinə uyğun olaraq igid və qəhrəman böyüyürlər. Xalqın yaratdığı pedaqoji dəyərlərə, yaradıcı ənənələrə əsaslanaraq gənc qəhrəmanlar olduğu kimi şagirdlərə çatdırılır.

Koroğlu ilə Dəli Həsən qolunda da igidliyi hələ heç kimə bəlli olmayan Koroğlu hamını qorxu altında saxlayan yollar cəngavəri düşmənə aman verməyən Dəli Həsənlə qarşılaşır. Koroğlunun igidliyi Dəli Həsənə güc verir, onu daha da cəsarətli edir. Göründüyü kimi igidlik, mərdlik, qəhrəmanlıq problemi orta ümumtəhsil məktəblərində tədris olunan əksər fənlərin məzmununda öz ifadəsini tapmışdır. Onların şagirdlərə necə çatdırıldığını yoxlamaq məqsədilə V-IX sinfin ədəbiyyat və Azərbaycan tarixi fənlərini tədris edən müəllimlərlə aşağıdakı suallarla müraciət olundu:

S. – Tədris etdiyiniz mövzulardan təqribən neçəsində igidliklə bağlı məsələlərə yer verilmişdir.

C. – Onu saymamışıq, tədris edəndə görmək olur.

S. – Hansı yollarla şagirdləri igidlik, qəhrəmanlıq ruhunda tərbiyə edirsiniz?

C. – Sinfin səviyyəsinə uyğun olanları seçirik.

S. – Siz insana bilirsinizmi şagirdləri igidlik, qəhrəmanlıq ruhunda tərbiyə edə bilirsiniz?

C. – Onlarla aparılan söhbətdən bunu görə bilirik.

Müəllimlərlə keçirilən sorğuların cavabları çox da qaneedici olmasa da, hiss olunur ki, müəllimlər şagirdlərin bu ruhda tərbiyəsinə önəm verirlər.

Aparılan araşdırmalar göstərir ki, V-IX siniflərin Azərbaycan tarixi dərsliklərində verilmiş mətnlərin əksəriyyəti bu qəbildəndir. Dərslikdə verilmiş "Yadellilərə qarşı mübarizə" mətnində Qarabağda, Şirvanda, Şəkidə və İran ağalığına qarşı üsyanlardan, Hacı Çələbinin cəsarətliliyindən, Ağa Məhəmməd şah Qacarın hücumları və onlara cavablarından bəhs olunur. Mətnin tədrisində müəllimin Hacı Çələbinin dar ağacı altında nitqinin Nadir şahın xoşuna gəlməsini bildirməsi və onun dediklərinin şagirdlərə çatdırması sözün əsl mənasında igidliyin, cəsurluğun, onları içində yaşada bilməsinin bariz nümunəsidir. Dərslikdə verilmiş "Cavad xan" mətni də igidlik, qəhrəmanlıq nümunəsidir. Cavad xan ruslara qarşı vuruşan cəngavər idi. 1786-1804-cü illərdə Gəncə xanı olan Cavad xan Qacar tayfasının Ziyadoğlular nəslindən idi. Sağlam bədənli, vüqarlı, cəsur, igid Cavad xan vətənin azadlığı uğrunda canını belə qurban verməyə hazır olan qəhrəman övladlardandır. Cavad xanın qadını cəsarətli Bəyim xanım da igidliyi ilə seçilir. Döyüş meydanında Cavad xandan geri qalmır.

Aparılan eksperiment və sorğuların nəticəli göstərir ki, şagirdlərin cəsarətli, igid və qəhrəman kimi tərbiyə olunmalarına imkan verən mövzular çoxdur. Şagirdlər də bu işə çox həvəslidirlər. Bu ondan irəli gəlir ki, yeniyet-mələr igidliyə, qəhrəmanlığa aid hadisələrin iştirakçısı olmağa çox maraqlıdırlar. Bu baxımdan da belə mətnlərin tədrisində onlar çox maraqla dinləyiciyə, iştirakçıya və icraçıya çevrilə bilirlər. Bütün bu deyilənləri ümumiləşdirərək belə qənaətə gəlmək olar:

- Orta məktəblərin V-IX siniflə-rində şagirdlərdə milli-mənəvi dəyərlərə məhəbbət hissinin formalaşdırılması üçün kifayət qədər mətnlər vardır.
- Mətnlərdə verilmiş igidlik, qəhrəmanlıq nümunələrini şagirdlərə çatdırmaq üçün müvafiq üsul və vasitələr düzgün seçilməlidir.

- Şagirdləri igidlik, qəhrəmanlıq ruhunda tərbiyə etmək üçün ermənilər tərəfindən işğal olunmuş torpaqlarımızın 44 gündə alınmasında igidlik göstərən övladlarımızdan nümunə gətirmək məqsədəuyğundur.
- Şagirdlərə dəmir yumruq anlayışı ilə bağlı məlumat vermək, sənədli filmlər göstərmək əhəmiyyətlidir.
- Azərbaycanın Ali Baş Komandanı, Prezident İlham Əliyev cəsarətli, qorxmaz qəhrəmanlıq səhnələri ilə dolu işləri haqda şagirdlərə dönə-dönə məlumat vermək və onları döyüş iştirakçılarının şəkillərini toplamağa və fotoalbom düzəltməyə sövq etdirmək problem baxımından əhəmiyyətlidir. Bütün bunlara əməl etmək problem baxımından çox önəmlidir.

**Problemin aktuallığı.** Yeniyetmələrin igidlik, mərdlik, qəhrəmanlıq, milli-mənəvi dəyərlərin aşılanması ruhunda tərbiyə edilməsi işin aktuallığını təşkil edir.

**Problemin yeniliyi.** Ədəbiyyat və Azərbaycan tarixi dərslikləri problem baxımından araşdırılmış, mövzular sistemləşdirilmiş, onlardan nümunələr gətirilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Əldə edilmiş nəticələr yeniyetmələrin milli-mənəvi ruhda tərbiyə edilməsində, dərsliklərin, dərs vəsaitlərinin və elmi-tədqiqat işlərinin hazırlanmasında istifadə oluna bilər.

**Ədəbiyyat:**


1. Aslanlı, M.İ. Azərbaycan ədəbi və ictimai-pedaqoji fikrində fiziki tərbiyə. / M.İ. Aslanlı. – Bakı: Azərnəşr, -2008. -424 s.
2. Bünyadov, Z.M. Azərbaycan VII-IX əsrlərdə. / Z.M. Bünyadov. – Bakı: Azərnəşr, – 1989. – 336 s.
3. Həşimov, Ə.Ş. Pedaqogika kursunun tədrisində xalq hikmətindən istifadə. / Ə.Ş. Həşimov. – Bakı: Maarif, – 199. –225 s.
4. Həsənov, A.M. Azərbaycan uşaq ədəbiyyatında əks olunmuş mənəvi dəyərlərindən kiçik yaşlı məktəblilərin əxlaq tərbiyəsində istifadə. – Bakı: İşıq, – 1997. – 283 s.
5. Qasımova, L.N. Pedaqogika. / L.N. Qasımova, R.M. Mahmudova. – Bakı, 2021.
6. Qasımova, L.N. Ümumtəhsil məktəbləri şagirdlərinin milli-mənəvi dəyərlər əsasında tərbiyəsinin nəzəriyyəsi və təcrübəsi. Ped.elm.dok.dis. – Bakı, –2005. – 301 s.
7. Qumilyov, L.N. Qədim türklər. / L.N. Qumilyov. – Bakı: Gənclik, – 1983. – 536 s.
8. Nizamülmülk, Siyasətnamə. – Bakı: Elm, – 1989. – 212 s.



**E-mail:** mansur.manerov@mail.ru



**Redaksiyaya daxil olub:** 08.07.2024.

*UOT 372.*

***Muxtar Məmmədtağı oğlu Həsənov***
*Azərbaycan Memarlıq və İnşaat Universitetinin*
*nəzdində İnşaat Kollecinin direktor müavini,*
*fəlsəfə doktoru proqramı üzrə dissertant*

***Leyla Şiraslan qızı Nuruyeva***
*Azərbaycan Memarlıq və İnşaat Universitetinin nəzdində İnşaat Kollecinin müəllimi,*
*Dil-ədəbiyyat və Humanitar Fənn Birləşmə komissiyasının sədri*

***Günay Teyyub qızı Əliyeva***
*Azərbaycan Memarlıq və İnşaat Universitetinin nəzdində İnşaat Kollecinin Azərbaycan dili və ədəbiyyat müəllimi,*
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*https//orcid.org/0009-0008-2597-2072*
https://doi.org/10.69682/arti.2024.91(4).62-67

# MƏNTİQƏ, REAL GERÇƏKLİYƏ DAHA ÇOX SÖYKƏNƏN AŞIQ ƏLƏSGƏR YARADICILIĞINDAN BƏZİ NÜMUNƏLƏR

***Мухтар Мамедтаги оглу Гасанов***
*заместитель директора Строительного колледжа при Азербайджанском*
*Архитектурно-Строительном Университете,*
*диссертант по программе доктора философии*

***Лейла Шираслан гызы Нуруева***
*преподаватель Строительного колледжа при Азербайджанском*
*Архитектурно-Строительном Университете,*
*председатель объединенной комиссии лингвистики и гуманитарных наук*

***Гюнай Тейуб гызы Алиева***
*учитель Азербайджанского языка и литературы Строительного колледжа при Азербайджанском*
*Архитектурно-Строительном Университете,*
*диссертант по программе доктора философии*
*https//orcid.org/0009-0008-2597-2072*

# НЕКОТОРЫЕ ОБРАЗЦЫ ТВОРЧЕСТВА АШЫГ АЛЕСКЕРА, ОСНОВАННЫЕ НА ЛОГИКЕ И РЕАЛЬНОСТИ

***Mukhtar Mammadtaghi Hasanov***
*deputy director of the Construction College under the Azerbaijan University of Architecture and Civil Engineering,*
*doctorial student in the program of doctor of philosophy*

***Leyla Shiraslan Nuruyeva***
*teacher of the Construction College under the Azerbaijan University of Architecture and Civil Engineering,*

*chairman of the Joint Commission of Linguistics and Humanities,*

***Gunay Teyyub Aliyeva***
*teacher of Azerbaijani language and literature of the Construction College under the Azerbaijan University of Architecture and Construction,*
*doctorial student in the program of doctor of philosophy*
*https//orcid.org/0009-0008-2597-2072*

## SOME SAMPLES OF ASHYG ALESKER'S CREATIVITY, BASED ON LOGIC AND REALITY

**Xülasə.** Məqalədə Dünyanın maddi və mənəvi olaraq əksliyin vəhdəti qanununu üzrə mövcudluğu insanların genetik baxımından müsbət və mənfi qütblərə ayrıldığı göstərilməklə Türk millətinin də xarakterik xüsusiyyətlərinə toxunularaq türklərin müsbət qütbə aid olmaqla aktiv gen daşıyıcıları olduğu göstərilir. Dərin biliyə malik türklərin bir çox istiqamətlərdə olduğu kimi, ədəbiyyatda da çox böyük tarixi şəxsiyyətləri olmuşdur. Onlardan biri də mənəvi qütbə aid olan ruhumuzun qidası olan aşıq sənəti və onun zirvəsində dayananlardan biri də Aşıq Ələsgərdir. Aşıq Ələsgəri haqq aşığı adlandırmaqda yanılmayıblar. Onun yaradıcılığından seçmə nümunələr üzərində məntiqi izahlar verməklə müəlliflər Aşıq Ələsgərin həm də dərin məntiqə söykənən biliyinin olmasını ortaya qoyurlar. Bu isə çox saylı təhlillərə söykənən Aşıq Ələsgər haqqında deyilən fikirlər arasında yenilik kimi qiymətləndirilir.

***Açar sözlər:*** *əksliyin vəhdəti, maddi və mənəvi, genetik xüsusiyyət, xarakterik xüsusiyyət, məntiq aşığı, haqq aşığı, rəqəmlərin fəlsəfəsi, türk fəlsəfi baxışı, informativ yanaşma*

**Аннотация.** В статье показано, что материальное и духовное существования мира с точки зрения генетики делится на положительные и отрицательные полюса. Турки относятся к положительному полюсу и являются активными носителями ген. Во многих областях, турки обладали глубокими знаниями, также в области литературы можно найти множество великих исторических личностей. Искусство Ашыг Алескера, принадлежащее к духовному полюсу, является пищей нашей души, он является одним из представителей этого искусства. Давая логические пояснения избранным образцам в своей работе, авторы раскрывают знания Ашыг Алескера, основанные на глубокой логике. Это считается новизной среди мнений об Ашиг Алескере, основанных на многочисленных анализах.

***Ключевые слова:*** *единство противоположностей, материальное и духовное, генетическая особенность, характерная черта, логический ашыг, ашыг правды, истины, философия цифр, турецкий философский взгляд, информационный подход*

**Abstract.** İn the article, the material and spiritual existence of the world is divicled into positive and negative poles according to the low of the unity of opposites, and it is shown chat the Turks belong to the positive pole and have active gene carriers. Turks with deep knowledge have had great historical personalities in literature as well as in many areas. One of them is the art of ashıq, which belongs to the spiritual pole and is the food of our soul, and one of those who stand at its peak is Ashıq Alasgar. They did not make a mistake in calling Ashıq Alasgar the real ashiq. By giving logical explanations on selected examples from his work, the authors reveal Ashıq Alasgar knowledge based on sleep logic. This is considered also novelty among the opinions about Ashıq Alasgar based on numerous (any) analyses.

***Keywords:*** *unity of opposites, material and spiritual, genetic trait, characteristic trait, ashiq's logic, the real ashiq, philosophy of numbers, Turkish philosophical view, infortmative approach*

Tanrı dünyanı əksliyin vəhdətində yaratmışdır. Xeyir-şər, kişi-qadın, isti-soyuq, bərk-yumşaq, müsbət-mənfi, acı-şirin, maddi-mənəvi və s. Həm də dünyanı-maddi və mənəvi aləmi nizamlayacaq ruhu da vermişdir, bu ruh dünyaya səpələnmiş türklərə məxsusdur. Hər ziyanda bir fayda var demişlər. Səpələnmiş türklərin ruhu səpələnərək zəifləsə də onların birləşməyə, güclənməyə meylliliyi, onlardakı uzaqgörənlik daim inamlı olmalarına və bərpa edilmənin təmin edilməsinə zəmin yaradır.

Hazırda informasiya texnologiyalarının geniş tətbiqinin ziyanlı tərəfi olsa da faydalı tərəfi daha böyükdür və bunun bütün xalqlara, insanlara faydası var. Türklərə olan faydası isə əvəzedilməzdir. Niyə məhz türklərə? Səpələnmiş türklərin əlaqələrinin təmin edilməsi, özünəqayıdışı, oyanması, güclənməsi, illərin həsrətinə son qoyulması üçün virtual məkanın üstünlüklərindən bəhrələnmək üçün şans yaranmışdır, dünyanın dörd bir yanında olan türklər əvvəlcə xəyalən, virtual yəni mənəvi birlik üçün bu imkandan maksimum faydalanmalıdırlar. Türkün bu birliyə genetik olaraq ehtiyacı var. Gec-tez genlər öz yükünü tələb edir və edəcək (1, s.87).

İnsanlar gündəlik həyatlarında özləri də bilmədən mənfi yüklülərin aktivləşməsinə şərait yaradırlar. Mənfi yüklülərin birliyinin güclənməsi isə insanlığı sonucda məhvə apara bilir. İnsanlığın məhvi bəşəriyyətin məhvidir. Mənfi yüklülərin birliyində "hamı mənim üçün çalışmalı, yaşamalı lazım gəlsə canını belə əsirgəməməlidir" prinsipi əldə rəhbər tutularaq – məhvə gedilən yoldur.

Müsbət yüklülərin birliyi, güclənməsi isə dünyanı pisliklərdən xilas edə bilir, müsbət yüklülərin - türklərin şüarı "hər kəs üçün, birliyimiz Turan üçün və bütün dünya üçün" olmalıdır. Çox şükürlər ki, Tanrı türk genlərinin yükünü müsbət yaratmışdır (2, s.19).

Türkün genetik yükü müsbət yaradılmışdır ki, dünyada haqsızlığın qarşısı alınsın. Təbii ki, haqq haradadırsa, nahaq - böhtan da onun yanındadır. Bu əksliyin vəhdətidir. Və əksinə, nahaq haradadırsa, haqq da əzilmiş, sıxılmış vəziyyətdə onun yanındadır. Genetik yükü mənfi olanlar, "parçala, dağıt, ələ keçir, zəbt et" üçün yaşayırsa, haqq onun qarşısındadır, yəni "niyə? nədir günahı? dayan, qoy yaşasın, yardım et, əl tut, dəstək ver" və s. şəklindəki fikirlərlə. Necə ki, Fələstində İsrailin törətdiyi haqsızlığa, Türkiyədə genetik yükü müsbət olanlar meydanlara çıxıb etiraz etdiyi, dünyanın diqqətinə çatdırmaları, bəşəriyyət qarşısında həyəcan siqnalları çalmaları, Afrikada aclığa, səfalətə daha çox narahat olan, etiraz edən türk genlərinin səsidir. Ukraynada Rusiyanın haqsız hücumuna, etiraz səsidir. Dünyanın səsinə səs verən türklərin özlərinin sıx əlaqəsi, birliyi təmin edilməlidir. Bütün türk dünyasında baş verənlər daim izlənməli, gündəmdə saxlanmalı, hər tərəfdə, istər Suriyada, istər İraqda, istərsə Doğu Türküstanda baş verənlərə vaxtında münasibət bildirmək lazımdır.

Haqqı dərk etmək, düşünmək müsbət yükə aid olan məsələdir. Bu yükü Tanrı türklərə zaman - məkan - genetik faktorların birgə kombinasiyası ilə bəxş etmiş və etməkdədir. Hər üç faktor daim hərəkətdə, dəyişmədədir. Genetik yük özü də dəyişir, genin yükü müsbətdirsə və ona uyğun fəaliyyət göstərmirsə, yəni haqqa göz yumursa, passivlik, laqeydlik və s. çoxluq təşkil edirsə, dəyişikliyə məruz qalır, mənfiyə meyllənir. Tanrı verdiyi müsbət yükün özünü də qorumaq lazımdır, ona layiq olmaq gərəkdir. Eyni qayda ilə mənfi yük də mənfiliyindən əl çəkirsə müsbətə meyllənir. Bu yaxşı haldır, əgər sonacan gedəcəksə.

Ruhun özünü də daim gündəmdə saxlamaq, qəlbin səsinə səs vermək, onu cilalamaq lazımdır. İnsanlara dərgahdan gələn informasiyalar, impulslar vəhy şəklində ötürülür bu məntiqin imkanları ilə, qanunauyğunluqları ilə mənimsədilir. Qədimdə insanlara daha çox məntiqi informasiyalar sazın gücü ilə dastanlar formasında çatdırılıb (8, s.104). Hər dastan dinləmək, kino izləmək kimi bir məna daşıyır. Musiqi alətlərində milliliyimizi əks etdirən 3 mərhələli qapalı sistemdə daha çox informasiya ruhun cilalanması ilə bağlı üstünlük sazın üzərinə düşür. Zəngin informasiya sazda 5 sənətin birliyi ilə bağlıdır. Məsələn, muğam ifa etmək üçün muğamın tələb etdiyi səsi çıxaracaq genetik kod lazımdır. Hər boğaz muğamda zəngulə vura bilməz. Erməni muğam ifa eləmək istəyər, yəni onu oğurlamağa cəhd edər, lakin ifa edə bilməz, yenisini yarada bilməz. Çünki onlar daha çox Tanrıya deyil, Şeytana meylli olduqlarından, genetik kodları zamandan asılı olaraq ona uyğunlaşmışdır. Yəni onun genetik yükü mənfidir, onun səs telləri ona uyğunlaşmamışdır, yekunda oğru cilidinə düşmüşdür.

Aşıq Ələsgər yaradıcılığında məntiqi fikirlər geniş yer alır, onun misralarından bir neçəsinə məntiqi yanaşsaq baxıb görərik ki, burada sehrli aləmin yaradılışı ilə bağlı fəlsəfi-məntiqi izahlar diqqət çəkir. Hamımız bilirik ki, onluq rəqəmlərin yaradıcıları türkdür, yəni uyğur qardaşlarımızdır. Uyğurlar hazırda Çinin müstəmləkəsində olduqlarından bu kəşfi Çin özününkü hesab etməkdədir. Yəni aşıq Ələsgər onluq rə-

qəmlərin elmi fəlsəfi mənalarını şerin misraları ilə aydınlatmağa çalışır (3, s. 425).

Yaradan yaradıb külli-aləmi,
Arif olan bu fərmana "can" desin.
Yeddi yer, yeddi göy, yeddi də damu,
Səkkiz Cənnəti-Rizvana "can" desin.

Bildiyimiz kimi, onluq say sisteminin əsası 0-9 rəqəmləridir və bu 8 kubun əmələ gətirdiyi 0-9 rəqəmləri ilə ifadə olunur (5, s.21). Yəni belə təsəvvür edək masa üzərində heç bir kub yoxdursa "0", 1 kub qoyduqda 1, 2-ni qoyduqda 2, 3-nü qoyduqda 3 və 4 ədəd kub altda, 4 ədəd kub üstdə olmaqla 8 kub yerləşdirsək, 0-8 rəqəmləri ifadə olundu. "9" rəqəmi isə 8 kubun birlikdə əmələ gətirdiyi 9-cu kub, yəni "9"-u ifadə edəcəkdir. Bu rəqəmləri qədim türk fəlsəfi baxışlarına istinadən izah etsək:

- "0"- yox, boşluq, yox adlandırdığımız mənəvi aləmdir;
- "1" – Tanrıdır, təkdir, kainatın yaradıcısı, sahibidir;
- "2" - əksliyin vəhdətidir, yəni xeyir-şər, gecə-gündüz, isti-soyuq, acı-şirin, oğlan-qız və s;
- "3" – vəhdətin, yəni mübarizənin nəticəsidir, yəni qısacası nəticədir;
- "4" – tərəf anlayışı, yəni sağ, sol, qabaq və arxa tərəfdir;
- "5" – 4 tərəfin mərkəzidir, simmetriya mərkəzidir, yəni tərəflər arası simmetriyadır;
- "6" – həcmdir, simmetrikliyə uyğun müstəvilər toplusudur, kubdur;
- "7" – həcmin yaratdığı qatlardlr, yəni dünyanın yeddi qatıdır;
- "8" – cənnətdir, yəni qatların ən yaxşısı, ən möhkəmidir, mələklərin cəmləşdiyi qatdır;
- "9" – bütün kainatı içinə alan Dərgahdır, bütün onluq rəqəmlər 9-cu kubun içərisindədir (6, s.53).

Aşıq Ələsgər də bu fəlsəfədən məlumatlıdır və misralarında dünyanın 7 qatı barədə və eləcə də 8-ci qatın cənnət olduğunu Yəni kainatın maddi aləm kimi, yəni məkan olaraq 7 qatdan ibarət olduğuna diqqət çəkir, 8-ci qatın mələklərə aid olduğunu söyləyir. 8-ci qat maddidən mənəviyə keçiddir bu isə mələklərə aiddir. Mələklərə məxsus olan 8-ci qat Dərgahın qoruyucusu Tanrıya gedən yolun sonunda qərarlanıb. Haqqa yüksələnlərin və fikirlərin süzgəcdən keçirilməsi, filtr edilərək real çəki, real qiymət, real mövqe və qərarlaşacaq əbədi məkanın təftiş edilməsi üçün mələklərə aid olan məkandır (7, s. 250).

On iki aya qərar qoyub – bir ildi,
Altısı müttəsil, çox mötədildi,
Üçü bəddi, həmrah olmaq müşgüldü,
Qəsd eylər qovğaya, qana "can" desin.

Zamanın təkrarlanaraq irəliyə hərəkəti real gerçəklikdir (10, s.101). Təkrarlanmanın 364-365 gün olduğu və əksliyin vəhdətindən asılı olaraq türk təqvimi ilə 4 fəsil, 12 aya bölünmüşdür. 12 aya bölünən xeyir və şər günləri bərabər bölünmüşdür. İsti və soyuğun mübarizəsində 3 ay yaz və 3 ay payız gözəldir, isti və soyuq bərabər həddədir. 3 ay isti və 3 ay soyuqda isə bərabərlik kəmiyyət xarakterlidir, keyfiyyət fərqlidir, əks qütblərdir, normallıqdan aşırıdır, həddində deyil və yaşam üçün, vücud üçün narahat durumdur.

Novruzda bahara deyərlər "bəli",
Gah kamala yetər, gah olar dəli.
Gün vuranda, güneylərdən sel gəli,
Qüzey istər, zimistana "can" desin.

Yazın bir ayında xoş keçsə illər,
Zoğ verib rişədən, açılar güllər.
Qışın zəmhərin çəkən bülbüllər
Şeyda olsun, gülüstana "can" desin.

Kükrər dağlar, bir-birindən deyini,
Seçmək olmaz gədasını, bəyini.
Fərvərdində səbzə libas geyini,
Göydən yağan ağ neysana "can" desin.

Türk törələrinə görə vücudun rahatlığı və təbiətdə isti və soyuğun mübarizəsi fonunda ruhumuz maddi hesab edilən vücudumuzu bu harmoniyaya uyğunlaşdırmağa çalışır, yəni soyuqda istiyə meyilli yəni arana, istidə soyuğa meyilli yəni yaylaqda məskunlaşmağa kökləyir, nizamlamağa, mövcudluğu qorumağa çalışır.

Aranda qalanlar meyl eylər bağa,
İsti vurar, bürkü dolar otağa.
Bəzənər gözəllər, çıxar yaylağa,
Mənzilgahlar ol mehmana "can" desin.

Ələsgər Yaylaq-Aran, Aran-Yaylaq dövriyyəsinin, təkrarlanmalı olduğunu şerin gücü

ilə daha da lazımlı və vacib olduğunu önə çəkir və bu hadisəni təbiət gözəllikləri ilə vəsf edir ki, insanlar bu harmoniyadan qaçmasın, əməl etsinlər.

Yaylaq müntəzirdi, yolların gözlər,
Boyun əyər bənövşələr, nərgizlər.
Çeşməyə yetəndə gəlinlər, qızlar,
Göllərdə çalxanan sona "can" desin.

Olar gözəllərin əhdi-peymanı,
Alaçıq qurulcaq, kəsər qurbanı.
Ələsgər şəninə desin dastanı,
Fəxr eləsin, doğan ana "can" desin.

Yəni yayda aranda, qışda yaylaqda qalmaq məsləhət görülmür, buna əməl etmədikdə, insan vücudu əziyyət çəkir, dünyadan, həyatdan bezikir, yarandığına peşiman olmasın deyə təbiətlə hərəkət etməyi məsləhət görür. Yəni yayda Yaylaqda, Qışda Aranda olun deyir. Yəni təbiətin harmoniyasına uyğunlaşın deyir. Əks halda baş verəcək çətinliklərə dözməli olacağımızı aşağıdakı misralarla dilə gətirir:

İnsan payız ölə, yazda dirilə,
Zimistanda boran-qarı çəkmiyə.
Günü-gündən işi düşər müşgülə,
Hər kəs namus, qeyrət, arı çəkmiyə.

Ələsgər əksliyin vəhdətinə işarə vuraraq qeyd edir ki, gündüz gecəyə, gecələr gündüzə meylli, acı şirinə, şirin acıya meylli, isti-soyuğa, soyuq da istiyə meylli olduğunu, yəni xeyrin şərə, şərin də xeyirə ehtiyacı olduğunu misralarda vurğulayır.

Müxənnət zamana, bimürvət fələk,
Şamı sübhə, sübhü şama çəkirsən.
Ləhzədə açırsan min cürə kələk,
Gah pozursan, gah nizama çəkirsən.

Aşıq Ələsgər haqqı deməklə də real gerçəkliyi təsvir edə bilir, misralarında baharı canlandıraraq dağların yüksək ədalət nümayiş etdirdiyini heç kəsə fərq qoymadığını dilə gətirməklə insanları haqqa, ədalətə və real gerçəkliyə uyğunlaşmağa çağırır, insanları saxtalıqdan, haqsızlıqdan uzaqlaşdırmaq istəyir.

Bahar fəsli, yaz ayları gələndə
Süsənli, sünbüllü, lalalı dağlar.
Yoxsulu, ərbabı, şahı, gədanı
Tutmaz bir-birindən alalı* dağlar.

Xəstə üçün təpəsində qar olur,
Hər cür çiçək açır, laləzar olur,
Çeşməsindən Abi-Həyat car olur,
Dağıdır möhnəti, məlalı dağlar.

Yazın bir ayıdı çox yaxşı çağın;
Kəsilməz çeşməndən gözəl yığnağın.
Axtarma motalın, yağın, qaymağın...
Zənbur çiçəyindən bal alı, dağlar!

Yayın əvvəlində dönərsən xana,
Son ayda bənzərsən yetkin bostana.
Payızın zəmhəri* qoyur virana,
Dağıdır üstündən calalı, dağlar!

Gahdan çiskin tökər, gah duman eylər,
Gah gəlib-gedəni pərişan eylər,
Gahdan qeyzə gələr, nahaq qan eylər,
Dinşəməz haramı, halalı dağlar.

Ağ xalat bürünər, zərnişan geyməz,
Heç kəsi dindirib, xətrinə dəyməz.
Sərdara söz deməz, şaha baş əyməz,
Qüdrətdən səngərli, qalalı dağlar.

Köçər ellər, düşər səndən aralı,
Firqətindən gül-nərgizin saralı.
Ələsgər Məcnun tək yardan aralı,
Gəzər səndə dərdli, nalalı, dağlar!

Aşıq Ələsgərin bütün misraları real gerəçəkliyi ifadə edir. Yəni şerlərdəki məna, məzmun məntiqin gücü ilə qəlb qıran olmamalı, maddinin dalınca çox da qaçmamağı tövsiyə edir və onu şerlərində yüksək səviyyədə yadda qalan formada qafiyələrlə təqdim edir. Elmli insanla elmsizi qarşı-qarşıya qoyaraq elmsizi maariflənməyə dəvət edir. Elmsiz insanın bir eliobanı təmsil edə bilməsini mümkünsüz sayır. İnsanın məqsədli yaradıldığını, özbaşına olmadığını, haqq-hesab gününün olacağını inamla misralarında diqqətə çatdırır və hər kəsin çalışaraq deyilən eyhamlardan nə isə anlasın, əks halda kimsə onun qəlbini qıraraq aşıkar anladacaq (9, s.172).

Aşıq olub, diyar-diyar gəzənin,
Əvvəl, başda pür kamalı gərəkdi.
Oturub-durmaqla ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Xalqa həqiqətdən mətləb qandıra,
Şeytanı öldürə, nəfsin yandıra,
El içində pak otura, pak dura,
Dalısınca xoş sədalı gərəkdi.

Danışdığı sözün qiymətin bilə,
Kəlməsindən ləlü gövhər süzülə,
Məcazi danışa, məcazi gülə,
Tamam sözü müəmmalı gərəkdi.

Arif ola, eyham ilə söz qana,
Naməhrəmdən şərm eyləyə, utana,
Saat kimi meyli haqqa dolana,
Doğru qəlbi, doğru yolu gərəkdi.

Ələsgər haqq sözün isbatın verə,
Əməlin mələklər yaza dəftərə,
Hər yanı istəsə, baxanda görə,
Təriqətdə bu sevdalı gərəkdi (11, s.341).

Aşıq Ələsgər bu misraları ilə elmə, haqqa böyük dəyər verərək bildirir ki, hər an belə haqqı unutmamalı, yalnız elmin gücü ilə, ona doğru can atmalı, cəmiyyətdə insanları arif olmağa, ədəb-ərkanlı olmağa, hətta danışmadan bir-birini anlamağı bacarmağa çağırır. Yəni insanların öz aralarında yaratdığı ünsiyyət vasitəsindən də daha vacib, daha çox real gerçəkliyə yaxın olan məntiqli olmağa, məntiqin dili ilə anlamağa çağırır. Tanrı öz yaratdıqları ilə ünsiyyətdədir, bu dilin adı məntiqdir. Aşıq Ələsgərin Haqq aşığı adlandırılmasının səbəblərindən biri də real gerçəkliyə daha yaxın olması və daha məntiqli olması ilə bağlıdır.

**Problemin aktuallığı.** Hazırda dünya düzənindəki son hadisələr göstərir ki, dünya həqiqətən əksliyin vəhdətində mövcuddur. Bu vəhdət onu göstərir ki, dünya insanları və dövlətləri də müsbət və mənfi ruhun daşıyıcılarıdır. Çox şükürlər ki, Tanrı türk ruhunu müsbət yüklü yaratmış və formalaşmaqda olan türk insanlarına çatdırılmalı olan ən yaxşı mesajlardan biridir.

**Problemin elmi yeniliyi.** Aşıq Ələsgər yaradıcılığının əsas qayəsi odur ki, real gerçəkliyə söykənərək ortaya qoyduğu əsərlərindən açıq-aydın görünür ki, o məntiq elmini dərinliyi ilə qavramış və bütün şerlərində hadisələr məntiqi olaraq təhlil edilir. Məqalədə əsas yeni fikir ondan ibarətdir ki, Aşıq Ələsgərin Haqq Aşığı adlandırılması sadəcə sözdən ibarət deyildir, yazıb-yaratdığı şerlərin hamısı əksliyin vəhdəti qanununa əsasən real gerçəkliyə, yəni məntiqə söykənir.

**Problemin nəzəri və praktik əhəmiyyəti.** Məqalə Aşıq Ələsgər yaradıcılığını real gerçəkliyi ilə məntiqi olaraq mənimsəmək, onu yenidən araşdırmaq yollarında istiqamət verə bilər və aşıq sənətinin türk ruhuna necə yaxın olduğunu və bu yaxınlığın Aşıq Ələsgər yaradıcılığındakı sətiraltı mənalarla daha dolğun və yerində dərk edə bilər.

**Ədəbiyyat:**


1. H. Məmmədzadə. “Kitabi Dədə Qorqud” və soykökümüzün qaynaqları. -Bakı: Ozan, - 2000 - 121s.
2. M. Həsənov. Yaddaş fenomenliyi. -Bakı: Elm və təhsil, -2023. -48 s.
3. H. İsmayılov. Göyçə aşıq1ları və el şairləri. -Bakı: Səda, -2006. -492 s.
4. Q. Namazov. Aşığın sazı və sözü. -Bakı: Yazıçı, -1980. -155 s.
5. M. Əkbərov. Kibernetika və din. -Bakı: Azərnəşr, -1966. -44 s.
6. M. Əkbərov. Riyaziyyat haqqında söhbətlər. -Bakı: Gənclik, -1969. – 68 s.
7. M. Həsənov. İnformasiya və insan. - Bakı: ARTİ, - 2016. -302s.
8. Muxtar Həsənov. Məntiq və kurikulum. -Bakı: ARTİ, - 2018. -429 s.
9. Z. İslam. Haqq yerindədi. -Bakı: Qanun, - 2009. -375 s.
10. M. Həsənov, Nuranə Həsənova. Şagirdlərdə məntiqi təfəkkürün inkişafı. -Bakı: Elm və Təhsil, - 2019. – 148 s.
11. Q. Zimistanoğlu. Aşıq Ələsgərin bütün əsərləri. Bakı: OL MMC, -2014. – 486 s.



**E-mail:**hasanovmukhtar@gmail.com



**Redaksiyaya daxil olub:** 02. 07.2024

*UOT 371*

***Xurşud Cəlil qızı İsmayilova***
*Azərbaycan Dövlət İqtisad Universitetinin*
*Azərbaycan dili kafedrasının müəllimi*
*ORCID- 0000-0001-5171-0166*
https://doi.org/10.69682/arti.2024.91(4).69-73

***Könül Tariyel qızı İbrahimova***
*Azərbaycan Dövlət İqtisad Universitetinin*
*Azərbaycan dili kafedrasının baş müəllimi*

## ŞƏRQ POEZİYASININ İNCİSİ - MƏHƏMMƏD FÜZULİ

***Хуршуд Джалил гызы Исмайлова***
*преподаватель кафедры Азербайджанского языка*
*Азербайджанского Государственного Экономического Университета*

***Кёнуль Тариел гызы Ибрагимова***
*старший преподаватель кафедры Азербайджанского языка*
*Азербайджанского Государственного Экономического Университета*

## ЖЕМЧУЖИНА ВОСТОЧНОЙ ПОЭЗИИ – МУХАММЕД ФИЗУЛИ

***Khurshud Jalil Ismayilova***
*teacher at Azerbaijani language department*
*of Azerbaijan State University of Economics*

***Konul Tariyel Ibrahimova***
*senior teacher at Azerbaijani language department*
*of Azerbaijan State University of Economics*

## THE PEARL OF EASTERN POETRY – MUHAMMAD FIZULI

**Xülasə.** Məhəmməd Füzuli yaradıcılığı Azərbaycan ədəbiyyatı tarixində silinməz iz qoymuş, həqiqətən də böyük şair və alim olub və olaraq qalır. Onun mükəmməl təhsili, elm və fəlsəfənin müxtəlif sahələrində dərin biliyi onun şəxsiyyətinin çoxşaxəliliyini vurğulayır. Onun əsərləri, o cümlədən qəzəl və qəsidələri bəşər təcrübəsinin müxtəlif tərəflərini əks etdirən emosionallığı və fəlsəfi dərinliyi ilə oxucuları sevindirməkdə davam edir. Belə bir irs dünya ədəbi mədəniyyətində layiqincə şərəfli yer tutur.
***Açar sözlər:*** *əsərlər, Füzuli yaradıcılığı, lirika, poema, mahir sənətkar*

**Аннотация.** Мухаммед Физули был и остаётся поистине великим поэтом и учёным, чьё творчество оставило неизгладимый след в истории азербайджанской литературы. Его великолепное образование и глубокие познания в различных областях науки и философии подчеркивают многогранность его личности. Его произведения, включая газели и касыды, продолжают восхищать читателей своей эмоциональностью и философской глубиной, отражая разнообразные аспекты

человеческого опыта. Такое наследие заслуженно занимает почетное место в мировой литературной культуре.
***Ключевые слова:*** *произведения, творчество Физули, лирика, стихотворение, мастер*

**Abstract.**Muhammad Fuzuli was and remains a truly great poet and scientist, whose work left an indelible mark on the history of Azerbaijani literature. His excellent education and deep knowledge in various fields of science and philosophy emphasize the versatility of his personality. His works, including ghazals and qasidas, continue to delight readers with their emotionality and philosophical depth, reflecting diverse aspects of human experience. Such a heritage deservedly occupies an honorable place in world literary culture.

***Keywords:*** *works, creativity of Fuzuli, lyrics, poem, master*

Məlum olduğu kimi, Prezidenti İlham Əliyev dahi Azərbaycan şairi və mütəfəkkiri Məhəmməd Füzulinin anadan olmasının 530 illiyinin qeyd edilməsi haqqında sərəncam imzalayıb. Sənəddə göstərilir ki, Füzuli Azərbaycan bədii fikrinin inkişafında müstəsna yer tutan, Şərq ölkələri ədəbiyyatına güclü təsir göstərən qüdrətli sənətkardır və onun yubileyinin keçirilməsi şairin bədii-fəlsəfi irsini layiqincə dəyərləndirmək amalına xidmət edəcək.

Hərtərəfli biliyə malik mütəfəkkir kimi onun həyata, insana dərin məhəbbət aşılayan və daim gözəllik duyğusu ilə, ülvi ideallarla yaşamağa çağıran çoxcəhətli bədii-fəlsəfi irsi Azərbaycan xalqının bəşər mədəniyyəti xəzinəsinə bəxş etdiyi misilsiz mənəvi sərvətlərdəndir. Məhəmməd Füzuli anadilli poeziyanın mükəmməl nümunələrini yaratmış, Azərbaycan bədii dilini daha da zənginləşdirərək yeni zirvəyə yüksəltmişdir. Onun parlaq dühasının təcəssümü olan və bu gün də sevilə-sevilə oxunan əsərləri yarandığı ilk vaxtlardan geniş coğrafiyada yayılmış və müəllifinə böyük şöhrət qazandırmışdır.

Məhəmməd Füzuli istedadlı nümayəndələri ilə tanınan bütöv bir ədəbi məktəb formalaşdırmışdır. Öz müasirlərindən başlayaraq, sonrakı dövrlərdə Füzuli ənənələrinin davamçısı olmuş bütün görkəmli sənətkarlar bu nəhəng söz ustasının adını hər zaman ehtiramla yad etmişlər.

Füzulinin yubileyinin UNESCO tərəfindən qəbul olunmuş qərarla beynəlxalq səviyyədə layiqli şəkildə qeyd edilməsi milli mədəni dəyərlərin qorunmasına həmişə xüsusi diqqət və qayğı göstərmiş Ümummilli Lider Heydər Əliyevin adı ilə bağlıdır. Ölməz şairin 500 illiyi müstəqil Azərbaycan Respublikasında keçirilən ilk dünya miqyaslı möhtəşəm mədəniyyət və sənət bayramı olmuşdur [1].

Məhəmməd Füzuli Azərbaycan ədəbiyyatı və mədəniyyəti tarixinin iftixarıdır.

Azərbaycan ədəbiyyat tarixçiliyi elminin banisi Firidun bəy Köçərlinin Füzuli haqqında yazdıqlarına nəzər salaq: "Füzuli Azərbaycan ədəbiyyatını fars və ərəb girdablarından dartıb çıxartmış və dörd yanını sarmış boşluq içərisində yeni doğulmuş ədəbiyyatı çiyinlərinə almış və yenilməz addımlarla ta yüksəklərə qaldırıb parlaq bir sentimentalizm ədəbiyyatı olmaq üzrə vaxtına təqdim etmişdir. Füzuli öz dühası ilə Azərbaycana parlaq klassik bir ədəbiyyat verdi" [2].

Füzulinin yaradıcılığı Azərbaycan ədəbiyyatının hələ XVI əsrdə böyük tərəqqi qazanmasının əyani təsdiqidir.

Təsadüfi deyil ki, ilk Azərbaycan şairlərindən olan Füzuli ərəb və fars dillərinin təsirindən xilas olmaq üçün ciddi cəhd göstərmiş, sırf Azərbaycan xalq ifadələrindən istifadə edərək öz ana dilində yazmağa başlamışdır. Füzulinin əhəmiyyətini, onun Azərbaycan ədəbiyyatı tarixindəki yerini daha yaxşı anlamaq və qiymətləndirmək üçün bütün bunlar nəzərə alınmalıdır.

Türk, fars, ərəb dillərində şeir və nəsr inciləri yaradan böyük Azərbaycan şairi və mütəfəkkiri Məhəmməd Süleyman oğlu Füzuli 1494-cü ildə Kərbəla şəhərində anadan olmuş, 1556-cı ildə vəba xəstəliyindən orada vəfat etmişdir. Bunu bir çox tarixi mənbələr də təsdiq edir və Füzulinin məzarı indi də bu şəhərdə yerləşir. Sağlığında Yaxın və Orta Şərqdə məşhur söz ustadı kimi şöhrət qazanan Füzuli ədəbi yaradıcılığa çox erkən başlamışdır.

Azərbaycandan İraqa köçən şairin atası Süleyman, o dövr üçün oğluna mükəmməl təhsil verə bilib: ərəb və fars dilləri ilə yanaşı, riyaziyyatı, astronomiyanı, təbabəti, məntiqi dərindən öyrənmiş, sələflərinin - Firdovsi, Nizami, Xaqani, Hafiz, Nəvai və s. poeziyasını mükəmməl

başa düşmüşdür. Füzuli, demək olar ki, bütün həyatını onun ən mədəni və zəngin şəhərlərindən biri olan Bağdadda keçirmişdir. Böyük Azərbaycan şairi orada yaşayıb boya-başa çatıb, "Şərqin yetişdirdiyi əsl şairlərdən biridir[4]."

Füzuli nəinki mahir şair, həm də ensiklopedik savadlı alim idi. Bunu bir tərəfdən onun məntiqi, həndəsəni və astronomiyanı dərindən öyrənməsi ilə bağlı öz açıqlamaları, digər tərəfdən qədim yunan fəlsəfəsi ilə bağlı peşəkar müzakirələri, Platon kimi müdriklərin əsərlərindən götürülmüş parçaların incəliklə təhlili aydın şəkildə təsdiqlənir.

Məhəmməd Füzuli Azərbaycan türklərinin folklorunun əzəli kitabı olan "Kitabi-Dədə Qorqud"un yaradıcısı, böyük Qorqudu dünyaya gətirən Bayat soyundandır. Yəqin buna görədir ki, onun bütün yaradıcılığına xalqın çox sevdiyi folklor və poetik forma olan bayatının xüsusi təravəti və səmimiliyi hopmuşdur. Şeirlərinin ərəb-fars söz və birləşmələri ilə zəngin olmasına baxmayaraq, Füzuli yaradıcılığını hər bir azərbaycanlı üçün əziz edən məhz bu bayatı əhval-ruhiyyəsi, gərayla melodiyası, Azərbaycan xalq poeziyasının dalğasıdır. Məhz bu keyfiyyətlər Füzulinin poetik dilini Azərbaycan poeziyası və ümumən Azərbaycan ədəbi dili tarixində mühüm mərhələyə çevirir. Onun yaradıcılığı məzmun və sənətkarlıq baxımından izahı çətin olan bir möcüzədir. İnsanlıq, alimlik zövq möcüzəsidir.

Füzulinin lirikasında insan, onun əzəmətli, parlaq camalı təbiətdə olan bütün varlıqlardan üstün, qiymətli göstərilmişdir. Şair öz əsərlərində bədii sözün qüdrəti ilə bir-birindən cazibəli, əlvan, gözəl surətləri yaratmışdır. Bir qəzəlində o yazır ki, qüdrətin çəkdiyi hər bir rəsm gözəldir, lakin sevgilinin rəsmi hamısından cazibəli çıxmışdır. Füzuli yaradıcılığında xəlqilik birinci növbədə onun lirikasının əsas mövzusundan biri və hətta birincisi olan məhəbbətin tərənnümündə daha qüvvətli təzahür edir. Şair "Məni candan usandırdı, cəfadan yar usanmazmı?", "Pərişan xəlqi-aləm ahu əfqan etdiyimdəndir", "Tutuşdu ğəm oduna şad gördüyüm könlüm", "Ya rəbb, bəlayi-eşq ilə qıl aşina məni" və başqa insan məhəbbəti, sevgili həsrəti, eşq və ayrılıq iztirabları tərənnüm edən bir çox qəzəlləri xalqın dilində əsrlərcə ona görə əzbər olmuşdur ki, Füzuli bu şeirlərdə sadə insanların ruhuna, qəlbinə dərindən nüfuz edə bilmiş, onların canlı hisslərini, kədər və iztirablarını həyat həqiqəti kimi yüksək bədii ümumiləşdirmələrlə, əsl sənətkarlıq ehtirası ilə sadə, təbii və aydın formada ifadə etmişdir.

*Tutuşdu qəm oduna şad gördüyüm könlüm,*
*Müqəyyəd oldu ol azad gördüyüm könlüm.*
*Diyari-hicrdə seyli-sitəmdən oldu xərab,*
*Fəzayi-eşqdə abad gördüyüm könlüm*

Füzuli yaradıcılığının yüksək zirvəsi - "Leyli və Məcnun" poemasıdır. Şərq xalqları içərisində çox geniş yayılmış bu mövzunun qədim bir tarixi vardır. Hələ qədim zamanlardan ərəb şifahi ədəbiyyatında mövcud olan bu mövzuda ilk dəfə 1188- ci ildə Nizami Gəncəvi epik poema yazmış, sonralar onlarca Şərq şairi bu mövzuya müraciət etmişlər. "Leyli və Məcnun" türk ədəbiyyatının da sevimli mövzularından olmuş və hələ XV əsrdən başlayaraq türk dilində bir çox "Leyli və Məcnun" əsərləri yaranmışdır ki, bunların içərisində geniş şöhrət qazanıb nadir sənət nümunəsi kimi əbədiləşən Füzuli poeması olmuşdur. Füzuli özünün həssas sənətkar təbiətinə çox uyğun olan bu mövzunu sələflərindən fərqli bir şəkildə işləyərək, əsərə bir çox yeni epizodlar və mövzu ilə bağlı türk xalq ədəbiyyatında yayılan rəvayətlər əlavə etməklə insanın mənəvi əzəməti, insan gözəlliyinin ülviliyi və məhəbbətin qüdrətini tərənnüm edən ölməz sənət abidəsi yaratmışdır. Saf, təmiz eşqin mənəvi qələbəsini təsdiq edən bu əsərində şair bir sıra ictimai məsələlərə də toxunmuş, sevgi azadlığı, məhəbbət aləmində bərabərlik, insan şəxsiyyətinə hörmət, vəfa, sədaqət, fədakarlıq, dəyanət kimi gözəl sifətlərdən bəhs etmişdir [7].

*Mən gövhərəm, özgələr xiridar.*
*Məndə degil ixtiyari-bazar.*
*Dövran ki, məni məzada saldı,*
*Bilməm Kim idi satan Kim aldı.*
*Olsaydı mənim öz ixtiyarım,*
*Olmaz idi səndən özgə yazım.*

Poemada Füzulinin fəlsəfi-irfani düşüncələrinə də geniş yer verilir. Və həm də bu problemlər burada da yenə insan qəlbinin bu ali hissilə bağlı şəkildə öz bədii-fikri tutumunu tapmışdır. Şair eləcə də İnsan və təbiət probleminin həllində bu zəmindən çıxış edir. Poemada "hü-

nər və kamal əhli" olan zəka sahiblərinin müsibəti, müqəddəs arzular önünə çıxan maneələrin keçilməzliyinə etiraz da baş mövzu ilə ustalıqla əlaqələndirilir. Əsərdə xüsusi diqqəti çəkən problemlərdən biri də orta əsr qadınlarının hüquqsuzluğuna, kölə vəziyyətinə etiraz və üsyandır. Zəmanəsinin ictimai dərdlərini mahir sənətkar qələmilə göstərən bu poema həm ideya baxımından, həm də bədii gözəlliyi ilə klassik Şərq poeziyasının misilsiz nümunələrindən biri kimi tanınmaqdadır. Son dərəcə maraqlı kompozisiyası, sadə, zəngin dili ilə seçilən bu əsəri şair lirik ricətlər, baş verən əhvalatların ruhuyla səsləşən gözəl təbiət təsvirləri ilə daha da zənginləşdirmiş, hadisələr və qəhrəmanların əhvali-ruhiyyəsinə uyğun ecazkar qəzəl nümunələriylə zinətləndirmişdir. Bədii sözə zərgər dəqiqliyi ilə yanaşmağı bacaran ustad sənətkar doğma dilin zəngin ifadə imkanları və klassik poetikanın qayda-qanunlarından məharətlə bəhrələnmiş, şeirin məna tutumuna təsir edən və zahiri gözəlliyini artıran bədii vasitələri bir-birilə vəhdətdə işlətmişdir [7].

Poemada xalq danışıq ifadələri, xalq məsəlləri, sadə el deyimləri, xalq ədəbiyyatının dərin hikmətini özündə əks etdirən aforizmlər ustalıqla əsas məzmuna bağlanır. Füzuli hələ gənc yaşlarında yazdığı "Bəngü Badə" əsərində də zəmanəsinin ictimai dərdlərinə toxunmuş, alleqorik şəkildə da olsa Beng və Badənin timsalında mülk-torpaq üstündə gedən qanlı çəkişmələrə, şöhrət, ad-san, mənəmlik üçün aparılan qəsbkarlıq vuruşmalarına qarşı çıxaraq Bəng ilə Badənin bir-birinə meydan oxuyan hücum və təhdidlərində dövrünün tarixi hadisələrinə işarə vurmuşdur. Füzuli zəmanəsində gördüyü ictimai çatışmazlıqlara, baş verən əbəs çəkişmələrə eləcə də "Söhbət ül-əsmar" əsərində öz münasibətini bildirmiş, yersiz qürur, mənasız öyünmələrin fayda vermədiyini, bir-birinin eyiblərini söyləməklə öz məziyyətlərini tərifləyən meyvələrin mübahisəsində göstərmişdir. Meyvələrin xassələri və onların hər birinin insan orqanizminə təsirini gözəl bilən şairin bu əsəri zahirən uşaqlar üçün yazılmış sadə əsər kimi görünsə də öz fəlsəfi-nəsihətamiz ruhu ilə diqqəti cəlb edir. Əsərdə ictimai ədalətsizliyə etiraz edən, dünyanın vəfasızlığından şikayətlənən şair yazır:

*Dünya işinin mədarı yoxdur,*
*Heç kimsəyə etibarı yoxdur.*
*Eylər birisini sahibi-tac,*
*Ol birisin eylər ona möhtac.*

Azərbaycan-türk şerinin ustadı Məhəmməd Füzuli Şərq xalqlarının ədəbiyyatına qüvvətli təsir göstərən dahi bir sənətkardır. Xaqani, Nizami, Rumi, Nəsimi, Yunus Əmrə, Nəvai kimi ölməz şairlər sırasında əzəmətlə dayanan Füzulinin şerimizdə yeri ucalardan ucadır. Yaxın və Orta Şərq ölkələrinin heç birində ondan sonra onun səviyyəsində şair yetişməmişdir. Bu gün də şerin dan yerində Füzuli ahından əbədi şam yanır!

Eşq beşiyində paklıqla tərbiyələnən, sözün fəlsəfi mənasında məhəbbət və dinin, dünya miqyasında bənzərsiz bir eşq təliminin banisi – filosofu və şairi olan Füzuli bütün dövrlərin ən böyük "aşiq"idir.

Romantizmi, müdrikliyi və həyat həqiqətini özündə birləşdirən Füzulinin yaradıcılığı Azərbaycan ədəbiyyatının inkişafında mühüm mərhələ oldu, onun əsərləri əsrlər boyu öz aktuallığını saxlayan klassikaya çevrildi.

**Problemin elmi yeniliyi.** Füzulinin lirikasında insan, onun əzəmətli, parlaq camalı təbiətdə olan bütün varlıqlardan üstün, qiymətli göstərilmişdir. Şair öz əsərlərində bədii sözün qüdrəti ilə bir-birindən cazibəli, əlvan, gözəl surətləri yaratmışdır. Füzuli yaradıcılığının Azərbaycan və bütün Şərq ədəbiyyatının gələcək inkişafına böyük təsiri olmuşdur.

**Problemin aktuallığı və praktik əhəmiyyəti.** Təsadüfi deyil ki, ilk Azərbaycan şairlərindən olan Füzuli ərəb və fars dillərinin təsirindən xilas olmaq üçün ciddi cəhd göstərmiş, sırf Azərbaycan xalq ifadələrindən istifadə edərək öz ana dilində yazmağa başlamışdır. Füzulinin əhəmiyyətini, onun Azərbaycan ədəbiyyatı tarixindəki yerini daha yaxşı anlamaq və qiymətləndirmək üçün bütün bunlar nəzərə alınmalıdır.

**Ədəbiyyat:**


1. https://president.az/az/articles/view/63328
2. Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı . II cilddə. I cild / F. Köçərli. -Bakı: "Avrasiya press", -2005. -560 s.
3. Əlizadə L. Məhəmməd Füzuli : Metodik tövsiyələr və elmi tədqiqi məqalələr məcmuəsi. -Bakı: Şəms, -2007. - 92 s.

4. Xəliloğlu S. Füzuli ədəbi estetikası. / S. Xəliloğlu - Bakı: Adiloğlu, -2004. - 418 s.
5. Kərimli T. Görünməyən Füzuli. -Bakı, 2003. -108 s.
6. Rüstəmova A. Seçilmiş əsərləri. 2 cilddə, II cild. / A. Rüstəmova. -Bakı, 2014. -658 s.
7. Məhəmməd Füzuli. Əsərləri. Altı cilddə. II cild. -Bakı, "Şərq-Qərb", -2005. -336 səh.

**E-mail:** ismayılova@mail.ru
1974@gmail.com
**Redasiyaya daxil olub:** 05.07.2024.

## *TƏHSİLDƏ MONİTORİNQ VƏ QİYMƏTLƏNDİRMƏ*
## *МОНИТОРИНГ И ОЦЕНИВАНИЕ В ОБРАЗОВАНИИ*
## *MONITORING AND EVALUATION IN EDUCATION*

*UOT 37.0*

***Gülnarə Qurban qızı İskəndərova***
*Azərbaycan Dillər Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0009-0000-6172-6428*
https://doi.org/10.69682/arti.2024.91(4).73-78

# TƏLƏBƏLƏRİN TƏHSİL NAİLİYYƏTLƏRİNİ TƏMİN EDƏN QİYMƏTLƏNDİRMƏ TEXNLOGİYASININ NƏZƏRİ ƏSASLARI

***Гульнара Гурбан гызы Искандарова***
*докторант по программе доктора философии*
*Азербайджанского Университета Языков*

# ТЕОРЕТИЧЕСКИЕ ОСНОВЫ ТЕХНОЛОГИИ ОЦЕНИВАНИЯ, ОБЕСПЕЧИВАЮЩИХ УЧЕБНЫЕ ДОСТИЖЕНИЯ СТУДЕНТОВ

***Gulnara Gurban Iskandarova***
*doctorial student in the program of doctor of philosophy*
*of Azerbaijan University of Languages*

# THEORETICAL FOUNDATIONS OF ASSESSMENT TECHNOLOGY THAT ENSURES THE EDUCATIONAL ACHIEVEMENT OF STUDENTS

**Xülasə.** Məqalədə tələbələrin təhsil nailiyyətlərini təmin edən qiymətləndirmə texnologiyasının nəzəri əsasları öz əksini tapmışdır. Hər bir qiymətləndirmə növü sinif mühitində və ya daha geniş miqyaslı kontekstdə aparılmasından asılı olmayaraq, bir sıra elmi prinsiplərə və fəlsəfi fərziyyələrə əsaslanır. Məqsədindən və ya istifadə olunduğu kontekstdən asılı olmayaraq hər bir qiymətləndirmə üç əsas hissəyə əsaslanır: tələbələrin biliyi necə təqdim etdiyinə və fənlə əlaqəli səriştələrini necə inkişaf etdirdiyinə dair model, tələbələrin performansını müşahidə etməyə imkan verən tapşırıqlar və əldə edilmiş performans sübutlarından nəticə çıxarmaq üçün şərh üsulları. Və yaxud istənilən qiymətləndirmə bir-biri ilə əlaqəli üç elementə və ya təmələ əsaslanır: təhsil nailiyyətinin qiymətləndiriləcək aspektləri (idrak), tələbələrin nailiyyətləri haqqında sübut əldə etmək üçün istifadə olunan tapşırıqlar (müşahidə) və tapşırıqlar nəticəsində ortaya çıxan sübutları təhlil etmək üçün istifadə olunan üsullar.
***Açar sözlər:*** *qiymətləndirmə, nailiyyət, yanaşma, bacarıq, inkişaf*

**Аннотация.** В статье отражены теоретические основы технологии оценивания, обеспечивающие учебные достижения обучающихся. Каждый тип оценивания, независимо от того, проводится ли оно в классе или в более широком контексте, основан на наборе научных принципов и

философских предположений. Независимо от цели или контекста, в котором оно используется, каждое оценивание основано на трех основных частях: модели того, как студенты представляют знания и развивают предметные компетенции, задания, позволяющие наблюдать за успеваемостью обучаемых, и методах интерпретации, позволяющих сделать выводы из результатов полученных доказательствами эффективности. Какое-либо оценивание основано на трех взаимосвязанных элементах или основах: оцениваемых аспектах образовательных достижений (познание), задачах, используемых для получения данных об успеваемости учащихся (наблюдение), и методах, используемых для анализа данных, полученных в результате задания.

***Ключевые слова:*** *оценивание, достижение, подход, умение, развитие*

**Abstract.** The theoretical underpinnings of the evaluation technology that guarantees pupils' academic success are reflected in the paper. All forms of assessments, whether carried out in a classroom or outside of it, are predicated on a number of philosophical and scientific tenets. Every assessment, regardless of its intent or setting, is built around three primary components: tasks that enable students to demonstrate their knowledge and develop subject-related competencies, and interpretive strategies for deriving inferences from the performance evidence gathered. Alternatively, any assessment is built around three interconnected components or pillars: the cognitive characteristics of educational accomplishment that need to be evaluated, the activities that are utilized to gather data about student achievement (observation), and the techniques employed to evaluate the data that is gathered from the tasks.

***Keywords:*** *Assessment, achievement, approach, skill, development*

Qiymətləndirmənin üç əsas məqsədi var: öyrənməni qiymətləndirmək (formativ qiymətləndimə), fərdi nailiyyətləri ölçmək (summativ qiymətləndirmə), və proqramları qiymətləndirmək. Hər bir qiymətləndirmə növü sinif mühitində və ya daha geniş miqyaslı kontekstdə aparılmasından asılı olmayaraq, bir sıra elmi prinsiplərə və fəlsəfi fərziyyələrə əsaslanır.

Məlumdur ki, qiymərləndirmə texnologiyalarının keçmiş və müasir konsepsiyaları vardır. Əvvəlki nəzəriyyə və modellərin əsas konsepsiyaları müəyyən məqsədlər üçün hələ də faydalı və lazımlı olsa da, daha yeni qiymətləndirmə ehtiyaclarını qarşılamaq üçün onların genişləndirilməsi və ya dəyişdirilməsi lazımdır.

İndi isə qiymətləndirmə üçbucağını nəzərdən keçirək. Bu forma həm müasir qiymətləndirmə təhlil və tərkib etmək, həm də yenilərini formalaşdırmaq baxımından əhəmiyyətlidir.

Məqsədindən və ya istifadə olunduğu kontekstdən asılı olmayaraq hər bir qiymətləndirmə üç əsas hissəyə əsaslanır: tələbələrin biliyi necə təqdim etdiyinə və fənlə əlaqəli səriştələrini necə inkişaf etdirdiyinə dair model, tələbələrin performansını müşahidə etməyə imkan verən tapşırıqlar və əldə edilmiş performans sübutlarından nəticə çıxarmaq üçün şərh üsulları.

Və yaxud istənilən qiymətləndirmə bir-biri ilə əlaqəli üç elementə və ya təmələ əsaslanır: təhsil nailiyyətinin qiymətləndiriləcək aspektləri (idrak), tələbələrin nailiyyətləri haqqında sübut əldə etmək üçün istifadə olunan tapşırıqlar (müşahidə) və tapşırıqlar nəticəsində ortaya çıxan sübutları təhlil etmək üçün istifadə olunan üsullar. (təfsir və ya şərh). (Knowing What Students Know: The Science and Design of Educational Assessment. (2001)- s.19)

olur. Bioloji hadisələrin aydınlaşdırılmasında riyazi hesablamaların, diaqramların qurulmasının, məlumatların toplanılması və təqdim edilməsinin də əhəmiyyəti olduqca böyükdür.

Ona görə də fənlərin tədrisi prosesində situasiya məsələlərinin həlli texnologiyasının nəzərə alınması zərurəti mövcuddur və daim diqqət mərkəzində saxlanılmalıdır. Son zamanlarda biologiyanın tədrisində situasiya məsələlərinin həlli texnologiyasında fəndaxili və fənlərarası inteqrasiyanın istifadəsinin imkanları geniş araşdırılır və onun imkanlarından istifadə mövcuddur. Ona görə də bu imkanlarda biologiya müəllimləri səmərəli istifadə etməklə tədrisin keyfiyyətini yüksəldə bilərlər [3, s.27].

Təhsil sisteminin vacib məsələlərindən biri təlimin keyfiyyətinin yüksəldilməsi və innovativ texnologiyalarının tətbiqi məqsədi ilə həyata keçirilən tədbirlərdir. Belə tədbirlərdən biri bu tədrisdə inteqrativ təlim üsullarında istifadəyə geniş yer verilməsi, təlim prosesində fəndaxili və fənlərarası inteqrasiyanın yaradılmasıdır. [4, s.32]

Beləliklə, tədris prosesində situasiya ilə əlaqədar məsələlərin həlli texnologiyasından istifadə etməklə onun modelə uyğun sistemləşdirilməsi başa düşülməlidir. Bunun nəticəsində şagirdlərin təfəkküründə dünyanın bütöv və bölünməz obrazını yaradılması ilə yanaşı həm də ümumelmi anlayışlar, kateqoriyalar və yanaşmalarda xarakterizə olunan yeni tip biliklərin formalaşmasına təkan verir.

Fənlərarası inteqrasiyanın yaradılması ilə əlaqədar situasiya məsələlərinin tətbiqi onun tiplərinə görə təsnifat formaları mövcuddur. Təsnifat formaları müxtəlifdir. Onların əsas aşağıdakı istiqamətləri mövcuddur.

-Şagirdlərin bilikləri mənimsəməsi və təfəkkürünü inkişaf etdirməsi ilə əlaqədar fənlərarası əlaqəni formalaşdırmaq;

-Müxtəlif siniflərdə keçirilən mövzuların əlaqələndirilməsi;

-Gələcəkdə keçirilən mövzularda perspektiv əlaqələrin yaradılması;

-Mövzuların tədrisi prosesində birtərəfli, ikitərəfli, üçtərəfli və çoxtərəfli əlaqələrin yaradılması;

-Mövzular arası epizodik və sistematik əlaqələrin yaradılması;

-Hər keçirilən mövzuya uyğun təlim-tərbiyə məqsədi ilə tətbiq edilən əlaqələr.

Biologiya dərsliklərində dünyagörüşü ideyaların dərk olunması və qavranılması eləcə də sistemli biliklərin formalaşdırılması üçün situasiya məsələlərinin həlli texnologiyası prosesində fənlərarası əlaqənin yaradılması zərurəti meydana çıxır. Şagirdlərdə elmi dünyagörüşün hərəkətli inkişafı üçün biologiya təliminin böyük imkanları mövcuddur. Bu imkanlardan istifadə aşağıdakı hallarda həyata keçirilir:

-Bir fənnin tədrisi prosesində qazanılmış bilik, bacarıq və vərdişlərdən digər fənn üzrə biliklərin qazanılması, sistemləşdirilməsi və tətbiq edilməsi üçün istifadə etdikdə şagirdlərin təfəkkürü inkişaf edir.

-Şagirdlərin təlim prosesində öyrənilən hadisələrin dərk edilməsinə və ümumiləşdirilməsinə ehtiyac olduqda onların bilik və bacarıqları inkişaf edir.

-Bir fənnə dair biliklərin digər fənnin problemlərini daha yaxşı başa düşməyə kömək etdikdə təlimin keyfiyyəti yüksəlir.

Situasiya tapşırığı: Mövzu 3. Mədə və bağırsaqlarda həzm

İnsan mədəsində bir sutka ərzində 2-2,5 l mədə şirəsi ifraz olunur.

Şagirdlər üçün suallar:

1. Mədə şirəsinin tərkibi haqqında hansı fikirləri söyləyə bilərsiniz?

2. Xlor turşusunun məhlulu mədədə hansı funksiyaları yerinə yetirir?

3. Mədədə turşu konsentrasiyası azalarsa və ya artarsa nə baş verir?

Suallara cavablar:

1. “Mədə və bağırsaqlarda həzm” mövzusu ilə bağlı situasiya tapşırığıdır. Mədə boşluğunda turş mühit (0,5% HCl) olur. Mədə şirəsi rəngsiz, şəffaf maye olub, turş reaksiyaya malikdir. (pH 1,5-4), o əsasən xlorid turşusunun (HCl) sulu məhlulundan, həzm fermentlərindən və mukopolisaxaridlərdən ibarətdir. Reaksiyası turşdur. Mədə şirəsinin vacib hissəsi xlorid turşusudur. İnsan mədəsində bir sutka ərzində 2-2,5 l mədə şirəsi ifraz olunur.

2. Xlorid turşusu qidanın həzmində əsas rol oynayır. Xlorid turşusu mədə şirəsinin tərkibindəki qeyri-fəal pepsinogeni fəal pepsinə çevirir. Onun təsirindən zülallar denaturasiyaya uğrayır və fermentlər tərəfindən asan hidroliz olunur. Xlorid turşusu həm də bakteriosid təsir göstərir, mədəyə daxil olan bakteriyaları məhv edir. Mədə çıxacağı-

nın reflektor açılıb-bağlanma funksiyasında iştirak edir. Bağırsağa keçən xlorid turşusu mədəaltı vəzin, qara ciyərin fəaliyyəti üçün vacib olan sekretin və digər hormonların ifrazını fəallaşdırır.

3. Turşu konsentrasiyasının azalması və artması həzm prosesini pozur. Mədə şirəsinin çox ifraz olunması, xlorid turşusunun kifayət qədər neytrallaşmaması və mədə möhtəviyyatının mədədən ləng keçməsi ilə əlaqədardır. Konsentrasiya artdıqda, turşu mədənin divarlarına həzmedici və ya dağıdıcı təsir göstərir ki, bu da şiddətli ağrı, mədə divarların iltihabı (qastrit) və ya şiddətli ağrı ilə müşayiət olunan xoraların əmələ gəlməsinə səbəb olur.

Mədə şirəsinin az ifraz olunması həzm prosesini pozur. Bu zaman mədə şirəsi dərman preparatı kimi təbii və süni şəkildə istifadə olunur. O, şəffaf və ya bir qədər bulanlıq, turş reaksiyalı olur.

Situasiya tapşırığı:

***Tapşırığın şərti***: Yeniyetmə iştahın azalması, xüsusilə yağlı qidalar qəbul etdikdən sonra halsızlıq, iştahasızlıq, yorğunluq, baş ağrıları, bulantı, ishal, qarın ağrısı, sağ qabırğaaltı nahiyədə ağrı və ağırlıq şikayətləri ilə sahə həkiminə müraciət edib. Xəstə duodenal intubasiyaya göndərildi və həkim həmçinin protozoaların olması üçün nəcisin müayinəsini təyin etdi. Onikibarmaq bağırsağın qida porsiyalarında 4 cüt qamçılı və qoşalaşmış nüvəli birhüceyrəli armudvari parazitlər aşkar edilmişdir. Xəstənin nəcisində dördnüvəli sistalar aşkar edilib.

Situasiya bağlı suallar:

Bu xəstədə hansı xəstəlik var?

Parazit hansı növə və ya sinfə aiddir?

Bu xəstəlik təbii fekal, yoluxucu və ya geniş yayılmışdır?

Parazit tərəfindən yoluxma yollarını və xəstəliyin qarşısını almaq üçün profilaktik tədbirləri müəyyənləşdirin.

Şagirdlər verilən suallara cavab verərkən müəyyən nəticələr çıxarmalıdır. Yetkin formanın və sistanın struktur xüsusiyyətlərinə əsaslanaraq bu paraziti müəyyən sistematik qrupa aid etmək və onun latınca adını vermək lazımdır. Ağrılı nahiyəyə və simptomlarına əsaslanaraq, hansı xəstəlikdən danışıldığını təxmin etməlidir.

Yoluxma yollarını və parazitin həyat fəaliyyətinin xüsusiyyətlərini bilmək, bu parazitar xəstəliyin yayılması haqqında nəticə çıxarmağa, şəxsi və ictimai profilaktika üsulları haqqında məlumatlanmağa imkan verəcəkdir.

Müəllim dərs zamanı özünün peşəkar səviyyəsindən istifadə etməklə hər bir mövzunun tədrisində digər fənlərlə inteqrasiya şəraitində əlaqə yarada bilər.

Müəllim tədris prosesində fənlərarası inteqrasiya ilə əlaqədar situasiya məsələlərinin həlli texnologiyasına dair bilik, bacarıq və vərdişləri mükəmməl bilməlidir. Müəllim bu texnologiyadan düşünülmüş formada planlı və ardıcıllığı gözləməklə istifadə etdikdə keçirilən mövzu ilə əlaqədar şagirdlərin potensialını və təfəkkürünü inkişaf etdirə bilər.

**Problemin aktuallığı.** Məqalədə situasiya məsələlərinin həlli texnologiyası prosesində fənlərarası inteqrasiyadan istifadə ilə biliklər arasında qarşılıqlı əlaqəni yaradılmasının əhəmiyyəti vurğulanır.

**Problemin yeniliyi.** Mövzunun tədrisi ilə əlaqədar situasiya məsələlərinin həlli texnologiyası prosesində inteqrasiya bir fənnə aid olan qanun, nəzəriyyə və metodların başqa fənnin öyrədilməsində istifadəni nəzərdə tutur.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ümumtəhsil məktəblərinin müəllimləri, tələbə və magistrantlar istifadə edə bilər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının ümumi təhsil müəssisələri üçün "Biologiya fənni üzrə təhsil (kurikulum)". (VII-XI siniflər). Bakı –2023.
2. Hacıyeva, G.N. Biologiyanın tədrisi metodikası. Ali məktəblər üçün dərs vəsaiti. / G.N. Hacıyeva. -Bakı, 2018. -356 s.
3. İbrahimova X.Q. Biologiyanın tədrisində fəal təlim metodlarının tətbiqi. -Bakı: RN Novruz-94, -2005. -160 s.
4. İbrahimova X.Q. Məktəb biologiya kursunda məsələ həllinin texnologiyası. -Bakı: "Müəllim" nəşriyyatı, -2022. - 216 s.
5. Məmmədov N. Biologiya fənninin təlimdə fəndaxili və fənlərarası inteqrasiyası. Azərbaycan təhsil siyasətinin prioritetləri; müasir yanaşmalar beynəlxalq elmi konfransın materialları. Naxçıvan Şəhəri, 25 may 3016 cı il, - s. 277-271.
6. Sultanov R.L. Ümumtəhsil məktəbləri üçün biologiya fənni üzrə təhsil standartları, Bakı BAPQS-nın mətbəəsi, 2004, -28 s.

**E-mail:** xosqedem.ibrahimova59@gmail.com
**Redaksiyaya daxil olub:** 02. 07.2024

***XARİCİ DİLLƏRİN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНОСТРАННЫХ ЯЗЫКОВ***
***METHODOLOGY OF TEACHING FOREIGN LANGUAGES***

*UOT 372.881.111.1*

***Sahilə Əli qızı Quliyeva***
*Naxçıvan Dövlət Universitetinin müəllimi*
*https://orcid.org/ 0009-0001-9949-4199*
https://doi.org/10.69682/arti.2024.91(4).123-126

# TƏLƏBƏLƏRİN DİL BACARIQLARININ İNKİŞAF ETDİRİLMƏSİNDƏ İNGİLİS DİLLİ BƏDİİ MƏTNLƏRDƏN İSTİFADƏNİN ROLU: ELMİ ƏDƏBİYYATIN TƏHLİLİ

***Сахиля Али гызы Гулиева***
*преподаватель Нахчыванского Государственного Университета*

# РОЛЬ ИСПОЛЬЗОВАНИЯ АНГЛОЯЗЫЧНЫХ ХУДОЖЕСТВЕННЫХ ТЕКСТОВ В РАЗВИТИИ ЯЗЫКОВЫХ НАВЫКОВ СТУДЕНТОВ: АНАЛИЗ НАУЧНОЙ ЛИТЕРАТУРЫ

***Sahila Ali Guliyeva***
*teacher at Nakhchivan State University*

# THE ROLE OF USING ENGLISH LITERARY TEXTS IN DEVELOPING STUDENTS' LANGUAGE SKILLS: A SCIENTIFIC LITERATURE ANALYSIS

**Xülasə.** Məqalə tələbələrin dil bacarıqlarının inkişaf etdirilməsində ingilis dilli bədii mətnlərdən istifadənin rolunun elmi ədəbiyyatda təhlilinə həsr olunmuşdur. Məqalədə bir çox alimlərin, dilçilərin, pedaqoqların, metodistlərin apardıqları tədqiqatlar və araşdırmalar nəticəsində əldə etdikləri fikirlər, yanaşmalar baxımından ingilis dilinin tədrisində öyrəncilərin dil bacarıqlarının inkişaf etdirilməsinə bədii ədəbiyyatın nə kimi töhfələr verdiyi araşdırılır və bu mülahizələr nöqteyi-nəzərindən bədii ədəbiyyatın rolu təhlil olunur.
***Açar sözlər:*** *bədii mətnlərin rolu, elmi ədəbiyyat, autentik materiallar, ingilis dilinin tədrisi*

**Аннотация**. Статья посвящена анализу роли использования англоязычных художественных текстов в развитии языковых навыков студентов в научной литературе. В статье рассматривается вклад художественных текстов в развитие языковых навыков учащихся при обучении английскому языку с точки зрения идей и подходов, полученных в результате исследований и изысканий многих ученых, лингвистов, педагогов и методистов. Автором также анализируется литературный текст с точки зрения этих суждений.
***Ключевые слова****: роль художественных текстов, научная литература, аутентичные материалы, обучение английскому языку*

**Abstract.** The article is devoted to the analysis of the role of using English-language literary texts in the development of students' language skills in scientific literature. The article examines the contributions of literary texts to the development of language skills of learners in English language teaching in terms of the ideas and approaches obtained as a result of the researches and investigations of many scientists, linguists, pedagogues, and methodologists, and the role of literary texts is analyzed from the point of view of these considerations.

***Keywords**: the role of literary texts, scientific literature, authentic materials, English language teaching*

Ədəbiyyat dil öyrənmənin təməlidir. O, bütün dil bacarıqlarının, xüsusən də danışıq və yazı bacarıqlarının inkişafında əsas rol oynayır. Ədəbiyyat hədəf dilin mədəniyyətini və adət-ənənələrini başa düşməyin ən yaxşı yollarından biridir. Bu, tələbələrə "zaman və məkan ba-xımından özlərindən fərqli mədəniyyətləri və ideologiyaları anlamağa və qiymətləndirməyə, həmin mədəniyyətlərdəki düşüncə və hiss ənənələrini və bədii formanı dərk etməyə" imkan verir. Ədəbiyyat dedikdə bədii mətnlər bə bədii əsərlər nəzərdə tutulur. Collie və Slaterə görə, ədəbiyyat təsdiqlənmiş materiallar, tələbənin mədəni təkmilləşməsi, dilinin inkişafı və fərdi iştirakıdır.[10.]

Bir çox pedaqoq və peşəkarların iddia etdiyi kimi, mədəniyyəti öyrətmədən ingilis dilini öyrətmək mümkün deyil, eləcə də mədəniyyətin öyrədilməsi dil öyrənənlər üçün "öyrəncilərin ümumi öyrənmə təcrübəsini artıran" beşinci bacarıq kimi qəbul edilir [17, s. 254-273].

İngilis dilinin tədrisi baxımından ədəbiyyat sinifdə istifadə üçün qiymətli autentik mənbə kimi qəbul edilir. Kitablar dil öyrənmək üçün faydalı olan düzgün söz ehtiyatını və cümlə nümunələrini təmin edir. Həqiqətən də tələbələr real həyatda müxtəlif situasiyalarda istifadə olunan dillə tanış olurlar [10]. Bundan əlavə, nitq bacarıqlarının inkişafı baxımından ədəbiyyatdakı mövzuların müzakirəsi tələbələri öz fikir və hisslərini ingilis dilində ifadə etməyə həvəsləndirir. Buna görə də tələbələr şifahi müzakirə yolu ilə əsərlərdə təqdim olunan mühüm məsələlərə öz fikirlərini ifadə etməklə nitq qabiliyyətlərini inkişaf etdirə bilərlər [7, s.93-113].

Xarici dildə bir insanla ünsiyyət qurarkən təkcə linqvistik səriştəyə malik olmaq kifayət deyil. Coğrafiyadan, əyləncələrdən, tarixi hadisələrdən və şəxsiyyətlərdən xüsusi mədəni istinadlar həmişə dildə istifadə olunur və hər bir mədəniyyət rəsmi və qeyri-rəsmi danışıq qaydaları ilə bağlı xüsusi normalara əməl edir. Ana dili danışanların bir-birləri ilə ünsiyyət qurarkən istifadə etdiyi sosial-mədəni qaydaları bilmədən yalnız lüğət və qrammatik məqamları əzbərləmək insanı xarici dildə bacarıqlı etmir. Dilin mədəni komponentini bilməmək nitq bacarıqlarının mükəmməlliyinə xələl gətirir [16, s. 9-17].

İngilis dili dərslərində bədii ədəbiyyat tədris edilməli və təqdim edilməlidir, çünki o, tələbələri lüğət elementləri, mədəniyyət və müxtəlif dil üslubları kimi bəzi dil aspektləri ilə tanış edir. O, həmçinin tələbələri ingilis dilini necə qiymətləndirmək anlayışı ilə tanış edir. İngilis dilli bədii əsərlərin öyrənilməsi tələbələrin nitq bacarıqlarından istifadəsini yaxşılaşdırmağa kömək edə bilər. Bu, müxtəlif mətnləri yaxşı başa düşərək ingiliscə oxumaq qabiliyyətini artırır. İngilis dilli bədii mətnləri oxumaqla tələbələr fikir əldə edə və tənqidi düşünmə hissini inkişaf etdirə bilərlər.

İngilis dilinin tədrisində bədii mətnlərdən istifadənin rolu haqqında elmi ədəbiyyatda bir çox alim və tədqiqatçıların fikirləri və təhlilləri xüsusi yer alır. Hill (1986: s. 12) qeyd edir ki, ingilis dilini öyrənənlər üçün ingilis ədəbiyyatının öyrənilməsi zəruridir, çünki o, dili qrammatik qaydalar baxımından daxililəşdirməyə imkan verir, artıq öyrənilmiş ifadələri və lüğəti gücləndirir və eyni zamanda yeni sözlər və struktur təqdim edir, halbuki Lazar (1993: s. 17) sübut edir ki, ədəbiyyat ingilis dili sinif otağında qoyulan dili zənginləşdirir və yeni dilin işlənməsi və təfsiri üçün mənalı və yaddaqalan kontekstlər təmin etməklə öyrənilməsini stimullaşdırır[12, s.12; 13, s. 17].

Viddousonun fikrincə, ingilis dilini tədrisi zamanı bədii ədəbiyyatdan istifadə tələbələrin biliyini, dünyagörüşünü genişləndirir, eləcə də dil və mədəni şüurunu təkmilləşdirir [19, s. 67-68].

Çnara və Marivana (2016) görə, dil müəllimlərindən tez-tez tələbələrə müxtəlif mövzularda təqdimatlar hazırlamaq və onlara dili praktikada tətbiq etmələrinə və bilik səviyyələrini öyrənməyə və ya təkmilləşdirməyə kömək etmək üçün müzakirə platformaları yaratmaq tapşırıqları vermələri tələb olunur [8, s.1-6]. Bədii mətnlərdən istifadənin aktuallığı bu zaman ortaya çıxır, çünki bu mətnlər vasitəsilə öyrənənlər xarici dil siniflərində müzakirələr yarada, danışıq oxu və yazı bacarıqlarını təkmilləşdirə bilərlər. Oxşar tədqiqatda Ur (1996) dil öyrənənlərinə bədii mətnin öyrədilməsinin aşağıdakı

müxtəlif yollarla təsir etdiyini göstərmişdir. Birincisi, o, öyrənənlərə dilin müxtəlif üslublarını və yazı üslublarını təqdim edir. İkincisi, bədii mətnlər öyrənənlərin söz ehtiyatını artırır və onları oxu bacarıqlarını inkişaf etdirməyə həvəsləndirir. Qrammatik material, linqvo-mədəni məlumatlar, nitq quruluşları ilə bağlı çətinliklər bədii mətnə uyğunlaşdırılaraq çıxarılır. İkinci dərəcəli, uyğunlaşdırılmış mətn ingilis dili öyrənən tələbəni dilin mədəni və linqvistik imkanlarına yaxınlaşdırır. Üçüncüsü, bədii mətnlər maraqlı yazı və müzakirələr yaratmaq üçün tramplin rolunu oynaya bilər. O, həmçinin motivasiyaya əlavə olunan və dili öyrənənlər arasında dilin inkişafı və incələnməsini asanlaşdıran intellekt və emosiyaları əhatə edir. [18, s.201]. Bədii mətnlərdən istifadə dil öyrənənlərin müxtəlif insan konfliktləri və vəziyyətlərindən xəbərdar olmasını təmin edir. Bu fikri dəstəkləyərək, Debreli, Ishanova, and Sheppard (2019) bədii ədəbiyyatın, öyrənənlərinin dil bacarıqlarını genişləndirərək linqvistik biliklərini, nitq, dinləmə və oxu bacarıqlarını təkmilləşdirdiyi fikrini irəli sürürlər [11, s.12-42]. Bənzər bir araşdırmada Babe və Yahya bədii mətnlərin dil üçün xammal kimi təsvir edilə biləcəyini iddia etdilər belə ki, bu əsərlər insan təcrübəsi haqqında hekayələr nəql edir və beləliklə, dilin gözəlliyini çox yönlü nümayiş etdirir. [6, s.80-85].

Audotirayada tələbələrə təqdim olunan bədii mətn mətnlər əsaslı tapşırıqların ən geniş yayılmış növü səhnələşdirilmiş rollu oyunlardır. Tələbələr mətnlə qarşılıqlı əlaqəyə girərək oyun vasitəsilə təxəyyül və yaradıcılıq haqqında məlumat əldə edirlər. Bədii əsərlərin səhnələşdirilmiş rollu oyunları tələbələrdən rolları orijinal kimi təqdim etməyi tələb edir və tələbələri real dil mühitinə yaxınlaşdırır, şifahi nitq bacarıqlarını inkişaf etdirməyə təkan verir. Cimermanovanın (2015) oxşar araşdırmalarında qrafik romanların xarici dil siniflərində müntəzəm olaraq istifadə olunan yaradıcı yazı fəaliyyətlərinə, hekayələrin qurulmasına və şəkillər üzrə işin aparılmasına şərait yaratdığı irəli sürülür [9, s.197].

Bəzi tədqiqatçılar ingilis dilli bədii mətnlərin sinif otaqlarında istifadə edildiyi zaman pedaqoji üstünlüklərə malik olduğunu iddia edirlər. Məsələn, A. Məhəmməd qeyd edir ki, ingilis dilinin tədrisində bədii mətnlərdən istifadə müəllimlər tərəfindən təkmilləşdirilmiş, şagirdlərin diqqətini müstəqilliyini və sərbəst rəylərini, ifadələrini təşviq edən tapşırıqlara diqqət yetirməyə imkan verir [15, s. 27-38]. [14, s.145-148]. L.B. Şerbanın fikrinə görə, bədii mətnlərin qavranılmasının, hədəf dildə olan faktorları anlamaqda böyük əhəmiyyət kəsb etdiyini vurğulayır [5, s.112]. E. Davidenko hesab edir ki, bədii mətnlər həm də yaradıcı təfəkkür bacarıqlarının inkişafına kömək edir, belə ki, onlar tələbələri başqa bir şəxsin nöqteyi-nəzərindən xəyali situasiyaları nəzərdən keçirməyə təşviq edir [4, s.90]. Müasir tədqiqatlar əsasən konkret xarici dil müəllimlərinin təcrübəsində bədii mətnlərdən istifadənin təhlilinə və ya xarici dilin tədrisində orijinal ədəbi əsərlərdən istifadənin nəzəri əsaslarına diqqət yetirir.

Xarici dildə ədəbiyyatı oxumaq bacarığı xarici dilin tədrisi prosesində əldə edilən əsas bacarıqlardan biridir. Xarici dillərin öyrədilməsinin ən çox kiçik qruplarda həyata keçirilməsinə baxmayaraq, hər bir öyrənci dili özünəməxsus şəkildə öyrənir. Hər bir tələbənin bu unikallığı müəllimin qarşısına ciddi tələblər qoyur, təhsil prosesini əhəmiyyətli dərəcədə çətinləşdirir, ümumi hazırlanmış dərs planında hər kəsin fərdi olaraq imkanlarının səviyyəsi nəzərə alınır ki, onlar ruhdan düşməsinlər.

Bədii əsərin mətni üzərində işləmək metodologiyasına yaradıcı yanaşma dil və nitq, nitq və təfəkkür, təfəkkür və ünsiyyət münasibətlərinin təhlilinə əsaslanır. Mətn nitq fəaliyyətində təlim və nəzarətin ən yüksək vahidi hesab olunur. Mətnlə işləmək aktiv ünsiyyət prinsipini və mətni anlamaq prinsipini təcəssüm etdirir.

Burada göstərildiyi kimi, ingilis dilini ədəbiyyat vasitəsilə səmərəli şəkildə öyrətmək olar. Dil müəllimləri ədəbiyyatdan ingilis mədəniyyətinə və dilinə yaxınlaşmaq üçün bir vasitə kimi istifadə edə bilər. Bu, düzgün yazmağı, effektiv ünsiyyət qurmağı, tənqidi düşünməyi və düzgün danışmağı öyrətməyin bir yoludur. Bu əsasda tövsiyə olunur ki, dil müəllimləri xarici dil siniflərində ədəbiyyatı mənimsəməli və onu şagirdlər üçün maraqlı etməlidir. Tələbələrin dil bacarıqlarının inkişaf etdirilməsində ingilis dilli bədii mətnlərdən istifadə onların təxəyyül, yaradıcılıq və tənqidi təfəkkürlərini inkişaf etdirməyə kömək edəcək, mədəni müxtəliflik və ifadə funksiyasını idarə etməyə, eləcə də yazı bacarıqlarını inkişaf etdirməyə imkan verəcək.

**Problemin aktuallığı.** Bədii mətnlər linqvistik şüuru inkişaf etdirir, şərh bacarıqlarını genişləndirir xarici dilin mənimsənilməsinə həvəs oyadır. Digər alimlərə əsasən bədii mətnlər aşağıdakı iki səbəbə görə xarici dil siniflərinə inteqrasiya olmalıdır: birincisi, xarici dilin öyrənilməsində konkret nümunələri təmin etdiyi üçün ideal model rolunu oynayır; ikincisi, öyrənənlərə dil və dil məlumatlılığı haqqında bilikləri inkişaf etdirməyə imkan verir; lüğət və qrammatikanı öyrətmək üçün orijinal mənbə rolunu oynayır. Bədii mətnlərin tələbələrin ingilis dilində şifahi bacarıqlarının formalaşdırılmasında əsas texnika kimi istifadə edilməsi yolları və üsullarının tədqiq olunması ingilis dilinin tədrisi metodikasında tələb olunan sahələrdəndir.

**Problemin elmi yeniliyi**. Tələbələrin dil bacarıqlarının inkişaf etdirilməsində ingilis dilli bədii mətnlərdən istifadənin rolunun elmi ədəbiyyatda təhlil və tədqiq etməkdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** tələbələrin ingilis dilində şifahi nitq bacarıqlarının formalaşdırılmasında bədii mətnlərdən istifadə prosesi həm ixtisası dil olan və, həm də digər ail təhsil müəssisələrində aparılan məşğələlərdə təlim mühitinin keyfiyyətinin təkmilləşdirilməsi zamanı istifadə etmək olar.

**Ədəbiyyat:**


1. Ağazadə, N.A. Xarici dillərin tədrisi metodikası və dilçilik. / N.A. Ağazadə. – Bakı: – 1974. – s.6-11
2. Hüseynzadə, G.C. Xarici dillərin tədrisində islahatların tətbiqi: Müəllimyönümlü tədrisdən tələbəyönümlü tədrisə keçid. // "Elm" ilinə həsr olunmuş Xarici dillərin tədrisinin aktual problemləri Respublika elmi konfransının materialları. – Bakı: ADU, – 2009, – s. 220-226.
3. Qaraqurt, V.V. İxtisası dil olan universitet tələbələrinə ingilis dilində mədəniyyətlərarası nitq ünsiyyətinin tədrisi metodikası: / Pedaqogika üzrə fəlsəfə doktoru dis. avtoreferatı / –Bakı, 2013. – 46 s.
4. Давиденко Е.С. Личностно ориентированный подход к обучению понимания смысла иноязычного художественного текста : дис. … канд. пед. наук. Таганрог, 2003. 180 с. s.90].
5. Щерба, Л.В. Преподавание иностранных языков в средней школе. Общие вопросы методики. Изд.2-е. / Л.В.Щерба. – М.:Высшая школа, – 1974. – 112 с.
6. Babaee, R., & Yahya, W. R. B. W. (2014). Significance of literature in foreign language teaching. International Education Studies, 7(4), 80-85. Available at: https://doi.org/10.5539/ies.v7n4p80.
7. Carrison, C. & Ernst-Slavit, G. (2005). From silence to a whisper to active participation:Using literature circles with ELL students. Reading Horizon, 46(2), 93-113.
8. Chnara, H., & Mariwan, H. N. (2016). The importance of literary texts in teaching language in EFL classes: The waste land as an example. International Journal of Literature and Arts, 4(1), 1-6.
9. Cimermanova, I. (2015). Creativity in EFL teacher training and its transfer to language teaching. Procedia-Social and Behavioral Sciences, 197, 1969-1975. 10.Collie and Slater, 2001; Ghosn, 2002; Hadaway et al., 2002; Hismanoglu, 2005; Keshavarzi, 2012.
10. Debreli, E., Ishanova, I., & Sheppard, C. (2019). Foreign language classroom management: Types of student misbehaviour and strategies adapted by the teachers in handling disruptive behavior. Journal of Cogent Education, 6(1), 12-42. Available at:https://doi.org/10.1080/2331186x.2019.1648629.
11. Hill, J. (1986). Teaching Literature in the Language Class Room. Macmillan.
12. Lazar, G. (1993). Literature and Language Teaching: A Guide for Teachers and Trainers. Cambridge University Press. https://doi.org/10.1017/CBO9780511733048
13. Mainland, C. (2013). Teaching literature like a foreign language; or, what I learned when I switched departments. Pedagogy: Critical Approaches to Teaching Literature, Language, Composition, and Culture, 13(1), 145-148. Available at: https://doi.org/10.1215/15314200-1814269
14. Muhammed, A. A. (2013). The effect of teaching literature on learning English language: A study on EFS (English as a foreignstudents) and EFL classes. International Journal of Advanced Research in Literature and Education, 1(1), 27-38.
15. Murdoch, G. (2002). Exploiting well-known short stories for language skills development. IATEFL LCS SIG Newsletter, 23: p. 9-17.
16. Sivasubramaniam, S. (2006). Promoting the prevalence of literature in the practice of foreign and second language education: Issues and insights. Asian EFL journal, 8(4): p. 254-273
17. Ur, P. (1996). A course in language teaching (pp. 201). Cambridge: Cambridge University Press. 170.
18. Widdowson, H.G. Authenticity and Autonomy in ESL // ELT Journal, – 1996. Vol. 50, – p.67-68


**E-mail:** **qulivasahila2017@gmail.com**
**Redaksiyaya daxil olub:** 17.05.2024

UOT 372.881.111.1

***Sevinc Əzizağa qızı Quliyeva***
*Bakı şəhəri, Nərimanov rayonu,*
*Evrika liseyinin ingilis dili müəllimi*
*https://orcid.org/0009-0005-0398-5591*
https://doi.org/10.69682/arti.2024.91(4).127-130

## İNGİLİS DİLİ DƏRSLƏRİNDƏ İNNOVATİV TƏHSİL TEXNOLOGİYALARI

***Севиндж Азизага гызы Гулиева***
*учитель английского языка лицея Эврика*
*Наримановского района города Баку*

## ИННОВАЦИОННЫЕ ОБРАЗОВАТЕЛЬНЫЕ ТЕХНОЛОГИИ НА УРОКАХ АНГЛИЙСКОГО ЯЗЫКА

***Sevinj Azizagha Guliyeva***
*English teacher at Eureka High School of Narimanov district of Baku city*

## INNOVATIVE EDUCATIONAL TECHNOLOGIES IN ENGLISH LANGUAGE LESSONS

**Xülasə.** Müasir cəmiyyətdəki həyat məktəblilərdən öz fikirlərini inkişaf etdirmək, təcrübəni dərk etmək, sübutlar silsiləsi qurmaq, özünü aydın və inamla ifadə etmək bacarığı kimi mühüm idrak bacarıqlarını inkişaf etdirməyi tələb edir. İngilis dili dərsləri keçirərkən tədris prosesinin səmərəliliyini artırmaq üçün şagirdlərin yaş xüsusiyyətlərini nəzərə alaraq aşağıdakı təhsil texnologiyalarından istifadə etmək səmərəli olar: tənqidi təfəkkürün inkişafı texnologiyası, tədqiqat texnologiyası, intensiv təlim, İKT, interaktiv yanaşma və oyun texnologiyası, layihə metodu, model tədris metodu, perspektivli inkişaf texnologiyası.
***Açar sözlər:*** *ingilis dili, öyrənmək, texnologiya, İKT, layihə, təfəkkür, interaktiv yanaşma.*

**Аннотация.** Жизнь в современном обществе требует от школьников развития таких важных познавательных навыков, как умение выработать собственное мнение, осмыслить опыт, выстроить цепь доказательств, выразить мысли ясно и уверенно. Для повышения эффективности образовательного процесса при проведении уроков английского языка я использую следующие образовательные технологии, учитывая возрастные особенности детей: технологию развития критического мышления, технологию исследования, интенсивное обучение, ИКТ, интерактивный подход и игровую технологию, метод проектов, модельный метод обучения, технологию перспективно-опережающего обучения.
***Ключевые слова:*** *английский язык, обучение, технологии, ИКТ, проект, мышление, интерактивный подход*

**Abstract.** Life in modern society requires students to develop important cognitive skills such as the ability to develop their own ideas, understand experience, build a chain of evidence, and express themselves clearly and confidently. In order to increase the efficiency of the teaching process when conducting English lessons, it is effective to use the following educational technologies, taking into account the age characteristics of students: critical thinking development technology, research technology, intensive training, ICT, interactive approach and game technology, project method, model teaching method, prospective development technology.

***Keywords:*** *English language, learning, technology, ICT, project, thinking, interactive approach.*

Müstəqil Azərbaycan Respublikasının memarı və qurucusu olan Ulu Öndər Heydər Əliyev ümumtəhsil məktəbinin hansı ideoloji prinsiplər əsasında işləməli olduğunu göstərərək

demişdir: “Siz Müstəqil Azərbaycanın məktəblərində təhsil alırsınız. Dövlət müstəqilliyimizin xalqımıza bəxş etdiyi nemətlərdən biri də odur ki, biz artıq öz təhsil sistemimizi xalqımızın, millətimizin tarixinə, mənəviyyatına, ənənələrinə uyğun qururuq. Mən ümidvaram ki, həm orta məktəblərdə, həm də ali məktəblərdə müəllimlərimiz gələcəkdə öz peşələrinə sadiq olacaqlar. Onların səyi nəticəsində bizim təhsil sistemi daha da təkmilləşəcək, bunların hamısı müstəqil Azərbaycanın gələcəyinə xidmət edəcəkdir”.

Bütün sahələrdə olduğu kimi təhsil sahəsində də İslahat Proqramının tələbləri baxımından dünya təhsil sisteminə inteqrasiya prinsipi əsasında bu günün şagirdləri gələcəyin qurucusu kimi tam bilikli, bacarıqlı bir sözlə hərtərəfli inkişaf etməlidirlər.

Ona görə də ümumtəhsil məktəblərində əsas fənlərlə yanaşı müxtəlif xarici dil fənləri də tədris olunur. İngilis dili fənni tədris olunan xarici dillər arasında ən geniş tətbiq olunandır.

Şagirdin bir şəxsiyyət kimi formalaşmasında məktəbin, peşəkar müəllimin böyük rolu var. Təlim yalnız biliklərin müəllimlərdən şagirdə mexaniki verilməsi deyil. Təlim fəaliyyəti çərçivəsində şagirdlərin mənəvi və fiziki inkişafı davam edir. Eyni zamanda onların ünsiyyət qabiliyyəti də formalaşır. İngilis dili dərslərində qeyd olunan xüsusiyyətlərə uyğun təlim prosesini təşkil etmək üçün müasir interaktiv təlim forması, təlim metod və üsullarından geniş istifadə etmək vacibdir.

İngilis dilinin tədrisini daha da maraqlı və səmərəli etmək üçün aşağıda qeyd olunan bir sıra iş formalarının, metod və üsulların tətbiqi metodikasını vermək məqsədəuyğundur.

Təlimdə istifadə olunan 4 əsas iş formasından istifadə hər bir fənn müəlliminin öz peşəkarlığı və sinif şagirdlərindən asılıdır. İngilis dili fənninin tədrisində əsasən cütlər və qruplarla işləmək daha da səmərəlidir. Çünki həm cütlərdə, həm də qrup daxilində işləyərkən şagirdlər ingilis dilində ünsiyyət quraraq söz bazalarını artırmış olurlar.

Cütlər və qruplarla iş ardıcıllıq, məntiq və istifadə olunan leksik fondun əhatəliliyinə görə qurulur. Əvvəla, şagirdlər belə dərslərdə daha fəal iştirak edirlər. İkincisi şagirdlər öz yoldaşları ilə birgə işləyərək ünsiyyət qururlar. Şagirdlər ingilis dilində sərbəst olaraq bir-birinə fikir bildirirlər. Qrup və cütlərlə iş zamanı şagirdlər yeni bilikləri mənimsəyərək mövcud biliklərini praktik cəhətdən daha da dərinləşdirirlər. Müstəqil fikir bildirmək qabiliyyəti artır, özünün və qrup yoldaşlarının çıxardığı nəticələri əks qrupun nəticələri ilə müqayisə edir, qiymətləndirir, obyektiv olaraq problemin həllinə nail olur. Belə dərslər şagirdlər üçün çox maraqlı olur.

İngilis dili dərslərini daha da maraqlı etmək üçün istifadə olunan iş üsullarından biri “Rollu oyunlar dır. Bu üsuldan həm dərs prosesində, həm sinifdənxaric tədbirlərin, həm də dərnək məşğələlərinin keçirildiyi zaman istifadə etmək olar.

Ümumiyyətlə, İngilis dili dərslərində tapşırıqlar verərkən fərdiləşmə prinsipini əldə meyar tutaraq, şagirdlərin marağına, biliyinə və məntiqi təfəkkürünə uyğun olaraq rollu oyunlar keçirmək olar. İngilis dili dərslərində kiçik situasiyalar verilir, onların açıqlanmasında rollu oyunların əhəmiyyəti böyükdür. Bundan başqa sinifdənxaric tədbirlərin keçirilməsində Amerika və İngiltərənin şair və yazıçılarının əsərlərindən qısa səhnəciklər qurula bilər. Bu səhnəciklər fənlərarası inteqrasiya yaradılmaqla Azərbaycanın şair və yazıçılarının əsərləri ilə müqayisə edilər.

Məsələn: V. Şekspirin “Romeo və Culyetta” əsərini dahi şair M. Füzulinin

“Leyli və Məcnun “əsəri ilə müqayisə oluna bilər. Bu da dərsin daha da maraqlı olmasında əhəmiyyətlidir.

“Əqli hücum” iş üsulundan testlərin və qrammatik çalışmaların işlənməsində istifadə etmək daha da məqsədəuyğundur. İngilis dili dərslərində bu üsuldan istifadə olunduqda biliklər qismən axtarıcılıq əsasında məntiqi və mücərrəd təfəkkür baxımından inkişaf edir, bacarıqlar formalaşır, zehni qabiliyyəti daha da artır.

“Problemli situasiya” üsulundan istifadə olunması şagirdləri həyatda qarşılaşdıqları problemlərin çevik həllinə, düşdüyü mühitə uyğun elmi, məntiqi nəticələr çıxarmasına kömək edir. Məsələn: “Sport in our life” (İdman bizim həyatımızda) mövzusunun tədrisi zamanı idman növləri və onun uşaqların inkişafındakı rolu haqqında video materiallar nümayiş olunur və bu oyunların daha çox hansının əhəmiyyətinin çox olması ilə bağlı problemlərlə bağlı müzakirə

aparılır. Bununla da qarşıya qoyulan problemlər həll olunur.

"Layihələrin hazırlanması" üsulunun tətbiqi 6-cı siniflərdə keçirilən "Health" (Sağlamlıq), "Enviorment" (Ətraf mühit) adlı mövzuların tədrisində daha da önəmlidir. Sağlamlığın əsas şərtlərinə aid layihələrin şagirdlər tərəfindən hazırlanması və onun tətbiqi ilə bağlı fikirlərin müzakirə olunması mövzunun tədrisini daha da maraqlı edər. Eyni zamanda yaşadıqları mikroərazidən ekoloji problemləri xarakterizə etmək və yaranan problemlərin aradan qaldırılması barədə layihələrin hazırlanması da önəmlidir. Layihələrin hazırlanması şagirdlərə biologiya, coğrafiya, fizika və digər fənlərdən aldıqları bilik və bacarıqlara əsaslanır.

Layihələrin hazırlanması şagirdlərdə tədqiqatçılıq və sərbəst işləmək bacarığını möhkəmləndirir, bir sıra problemlərin həlli üçün şagirdləri gələcək həyata hazırlayır.

"Söz assosiasiyası" üsulunun tətbiqi əsasən yeni mövzuların tədrisində çox önəmlidir. Bu üsuldan dərsə başlamamışdan öncə istifadə etmək daha məqsədəuyğundur. Bu məqsədlə müəllim mövzuya aid əsas sözlərdən ibarət məlumatı tezis şəklində şagirdlərə çatdırır. Məsələn: 7-ci sinifdə tədris olunan

"Travel" (səyahət) mövzusuna uyğun götürülən "beautiful" (gözəl) sözünə aid şagirdlər həmin sözün sinonimi olan "wonderful, splendid, remarkable" (qəşəng, yaraşıqlı, cazibədar) sözlərini də öyrənir və onları cümlədə işlədə bilirlər.

Həmçinin həmin sözlərin əks mənalarının öyrənilməsi də mövzunun daha maraqlı olmasına səbəb olur. Bu üsul dərs prosesində şagirdin əldə etdiyi nəticələri müqayisəli qiymətləndirməyə də əsas verir.

9-cu sinifdə tədris olunan mövzulardan biri "Nature" (təbiət) adlanır. Mövzunun tədrisi illik proqram bölgüsünə əsasən yaz fəslinə təsadüf edir. Bu mövzunun daha da maraqlı olması və şagirdlərin təbiətlə bağlı fikirlərinin söylənilməsi və dialoqların təşkili üçün dərsin təbiətin qoynunda təşkili daha da məqsədəuyğundur. Bu zaman şagirdlərin hər hansı parkda, təbiət bağlarında gördüklərini ingilis dilində şərh edərək dialoqlar qurması dərsi daha da maraqlı edər.

5-ci siniflərdə "Celebrate Holidays" (Bayramları qeyd etmək) mövzusunun tədrisində əsasən milli bayramımız olan "Novruz bayramı"na aid tapşırıqların və mövzunun tədrisi ilə bağlı novruz atributlarının ingilis dilində müzakirə olunması şagirdlər üçün daha da maraqlı olur.

İllik proqramda 5-ci sinifdə "Food" (Yemək) mövzusunu "Cooking" (Bişirmək) adı ilə tədris edərkən şagirdlərin müəyyən bir şirniyyat və ya hər hansı bir salat və yeməyin hazırlanmasında lazım olan inqridientlərin ingilis dilində öyrənilməsi də bu mövzunu daha maraqlı edir.

Azərbaycan dilində olduğu kimi, ingilis dili fənninin tədrisində də əsas məqsəd ingilis dilinin qrammatikasını öyrənməklə bərabər ünsiyyətlə bağlı söz ehtiyatının artırılmasıdır. Şagirdlərin öyrəndiklərini real həyatda tətbiqetmə bacarığının formalaşdırılması isə müasir dərsin əsas tələblərindən biridir. Məhz belə dərslərdə bu tələblər ödənilir. Dərsin məqsədi uşaqların öyrəndiyi lüğət tərkibini məişətdə tətbiq etməklə bərabər eyni zamanda evdarlıq bacarıqlarının aşılanması olur. Əsas məqsəd isə şagirdlərin ingilis dilində öz fikirlərini ifadə etmək və ünsiyyət qurmaq bacarığının inkişaf etdirilməsidir.

Deməli ingilis dili dərslərinin daha da maraqlı olması üçün hər bir fənn müəllimindən xüsusi bacarıq tələb olunur. Yeni təlim texnologiyalarının tətbiqi, fəal təlim metod və texnologiyalarından yerində istifadə olunması təlimin daha da maraqlı və keyfiyyətli olmasında vacib şərtdir.

**Problemin aktuallığı.** İngilis dilinin müasir tədris metodları xarici dillərin öyrənilməsinin klassik metodları əsasında qurulur. Ancaq psixoloji aspekt, informasiya texnologiyaları ona təsir etdi. 20 il əvvəl istifadə olunan ingilis dilinin tədrisi üsulları olduqca reproduktiv xarakter daşıyırdı. Sözləri öyrənin, mətni oxuyun, audio yazıya qulaq asın, məktub yazın - tərbiyəçinin verdiyi tapşırıqlar belə görünürdü. Bəlkə də bu səbəbdən uzun illər dili öyrənmiş böyüklərin əksəriyyəti ingilis dilində oxuyub yaza bilir, lakin bu dildə danışmaqda çətinlik çəkirlər.

**Problemin elmi yeniliyi.** İngilis dilinin tədrisi metodları, psixologiya və pedaqogika bilikləri onlara qavrayış və təfəkkürün xüsusiyyətlərini müəyyən etməyə, lazımi iş üsul və formalarını seçməyə imkan verir. Həqiqətən də, ingilis dili dərsləri ilə yanaşı, dərslərin təşkilinin digər formaları da məşhurdur: dəyirmi masa, konsert, dil klubu, konfrans, olimpiadalar və s. Bu, çoxlu sayda şagirdi dil mühitinə daxil etməyə imkan verir.

**Problemin praktik əhəmiyyəti.** Texnologiyanın praktiki tətbiqi yalnız bir texnologiyadan istifadə etmək lazım deyil. Şagirdin kommunikativ

sәriştәsini formalaşdırmaq üçün xarici dilin tәdrisi prosesinә müasir tәhsil texnologiyalarını inteqrasiya etmәklә vә bir neçә il әrzindә müasir rus vә xarici müәllimlәrin innovativ fikirlәrini diqqәtlә öyrәnmәk, sınaqdan keçirmәk vә uyğunlaşdırmaqla biz belә nәticәyә gәlirik ki, şagirdin subyektiv tәcrübәsinin açılmasına, onun üçün şәxsi әhәmiyyәtli tәrbiyә işinin metodlarının formalaşmasına, mәnәvi ideal-ların tәrbiyәsinә, tәnqidi tәfәkkürün, adekvat qiy-mәtlәndirmәnin vә özünә hörmәtin inkişafına töhfә verәn bir pedaqoji sistemdir.

**Әdәbiyyat:**


1. "Tәhsil Haqqında" Azәrbaycan Respublikasının Qanunu. Bakı, "Hüquq әdәbiyyatı", 2009.
2. Ümumtәhsil sәviyyәsindә yeni dövlәt proqramları (kurikulumları). Bakı, 2013
3. Әlizadә. Ә. Müasir Azәrbaycan mәktәbinin psixoloji problemlәri. Bakı, Pedaqogika, 2004
4. İnteqrativ kurrikulum: Mahiyyәti vә nümunәlәr. Müәllimlәr üçün vәsait (müәllif qrupu) Bakı, 2005 (İREX tәşkilatının xәtti ilә)
5. Mәmmәdzadә R. H. Tәhsildә keyfiyyәt aparıcı istiqamәtlәrdәn biri kimi. Bakı: Müәllim, 2010.
6. Бардин К.В. Как научить детей учиться. – Москва, 1987.



**E-mail:** sevinjshirinova85@gmail.com.



**Redaksiyaya daxil olub:** 29.05.2024

UOT 372.881.111.1

**Ruqiyyə Yasin qızı Həsənova**
*fəlsəfə doktoru proqramı üzrə dokrorant,*
*Naxçıvan Müəllimlər İnstitutu*
*https://orcid.org/0009-0001-8371-2438*
https://doi.org/10.69682/arti.2024.91(4).131-134

# V-IX SİNİFLƏRDƏ İNGİLİS DİLİ DƏRSLƏRİNİN SƏMƏRƏLİ TƏŞKİLİNDƏ MULTİMEDİYA VASİTƏLƏRİNDƏN İSTİFADƏ

***Ругия Ясин кызы Гасанова***
*докторант по программе доктора философии*
*Нахчыванский педагогический институт*

# ИСПОЛЬЗОВАНИЕ МУЛЬТИМЕДИЙНЫХ СРЕДСТВ ПРИ ЭФФЕКТИВНОЙ ОРГАНИЗАЦИИ УРОКОВ АНГЛИЙСКОГО ЯЗЫКА В V-IX КЛАССАХ

**Rugiyya Yasin Hasanova**
*doctorial student in the program of doctor of philosophy*
*Nakhchivan Pedagogical Institute*

# USING MULTIMEDIA IN EFFECTIVE ORGANIZATION OF ENGLISH LANGUAGE LESSONS IN V-IX GRADES

**Xülasə**. Multimedia texnologiyalarından təlim prosesində istifadə V-IX sinif şagirdlərinin ingilis dilini fəal yaradıcılıqla mənimsəmələrinə kömək göstərir, onları təhsil prosesinin fəal iştirakçısına çevirir. Bu vaxt passiv təlimdən aktiv öyrənməyə keçid baş verir. Məqalədə V-IX siniflərdə ingilis dili dərslərinin səmərəli təşkilində multimedia vasitələrindən istifadə problemi diqqət mərkəzinə gətirilir.
***Açar sözlər***: *multimedia, multimedia texnologiyaları, ingilis dili dərsləri, təlim prosesi, təlimin səmərəliliyi*

**Аннотация**. Использование мультимедийных технологий в образовательном процессе помогает учащимся V-IX классов активно и творчески осваивать английский язык, делая их активными участниками образовательного процесса. В это время происходит переход от пассивного обучения к активному обучению. В статье в центр внимания поставлена проблема использования средств мультимедиа в эффективной организации уроков английского языка в V-IX классах.
***Ключевые слова:*** *мультимедиа, мультимедийные технологии, уроки английского языка, учебный процесс, эффективность обучения*

**Abstract**. The use of multimedia technologies in the educational process helps students of grades V-IX actively and creatively master English, making them active participants in the educational process. At this time, there is a transition from passive learning to active learning. The article focuses on the problem of using multimedia in the effective organization of English lessons in V-IX grades.
***Keywords***: *multimedia, multimedia technologies, English lessons, educational process, learning efficiency*

Həmişə olduğu kimi, müasir dövrdə də təhsil bilavasitə elmi-texniki tərəqqidən, başqa sahələrdə, məsələn, iqtisadiyyatda, siyasətdə və s.-də özünü göstərən dəyişikliklərdən çox asılıdır. Məhz bunun üçün də təhsilin keyfiyyətinin yüksəldilməsi problemi hazırda həmişəkindən daha aktualdır. Bu, təhsilin hər bir pilləsində təlim prosesinin təşkilinin səmərəli yollarının müəyyənləşdirilməsi və onlardan faydalanma ilə

əlaqədardır. Odur ki, xarici dillər, o cümlədən ingilis dili getdikcə yeni məna daşımaqdadır.

Şagirdlərin ingilis dilinə səmərəli şəkildə yiyələnməsində müəllimin rolu böyükdür. O şəxsi və peşə keyfiyyətlərinin kamilliyi ilə yüksək nəticələrə nail olur. Təlim prosesinin, o cümlədən ingilis dili dərslərinin təkmilləşdirilməsi və optimallaşdırılması məqsədi ilə bir çox vasitələrdən istifadə olunur. Qabaqcıl və təcrübəli müəllimlər multimediya vasitələrindən faydalanmaqla həmin vasitələri səmərəlilik şərti hesab edirlər.

Müəllim yalnız dil və nitq bacarıqlarını formalaşdırmağa deyil, eyni zamanda şagirdləri "fərqli" mədəniyyət dünyası ilə tanış etməyə, onlara xarici ölkələrdəki fərdi həyat faktlarını anlamağı öyrətməyə, dilini öyrəndiyi xalqa hörmət hissini inkişaf etdirməyə səsləyir.

Təhsil insanda həyat üçün zəruri olan qabiliyyət və bacarıqları formalaşdırmağa və inkişaf etdirməyə şərait yaradır. Hazırda təhsil davamlı, qeyri-xətti və açıq olub, hər bir şəxsin bütün həyatı boyu öyrənməsini tələbata çevirir.

Multimedia texnologiyalarından təlim prosesində istifadə V-IX sinif şagirdlərinin ingilis dilini fəal yaradıcılıqla mənimsəmələrinə kömək göstərir, onları təhsil prosesinin fəal iştirakçısına çevirir. Bu vaxt passiv təlimdən aktiv öyrənməyə keçid baş verir.

İ.L. Bim yazır: "Multimedia" termini "*multum*" (*çox*) və "*media, medium*" (*fokus, vasitə, üsul*) kimi sözlərin birləşməsindən meydana gəlib. Bu termin interaktiv proqram təminatı ilə idarə olunan vizual və video effektlər arasında qarşılıqlı əlaqə kimi müəyyən edilir [1, s. 3].

Multimedia texnologiyalarının başlıca məqsədi təhsil və elmi məlumatların anlaşmasını asanlaşdırmaq məqsədi ilə bu və ya digər səmərəli üsul və vasitələrdən faydalanmaqdır. Müasir dövrdə haqqında danışılan texnologiyalara yüksək keyfiyyətli qrafika, müasir proqram təminatı, müxtəlif animasiyalar, eyni zamanda video və audio müşayiəti daxildir. Həmin multimedia elementlərinin əlaqələndirilməsi proqram təminatından istifadə ilə baş tutur.

V.V. Votobyovanın qənaətincə, "Multimedia mühitinin hər hansı bir kombinasiyadan istənilən formada istifadəsi mümkündür. Buraya daxildir: hərəkətli təsvirlər, mətn, səs effektləri, hipermətn, animasiya və s. Multimedia bütün əvvəlki audiovizual vasitələrin üstünlüklərini özündə ehtiva edir, lakin onların yerini tutmur. Bu üsul istənilən mürəkkəblikdə olan məlumatı qavramaq üçün əlverişlidir [2, s. 6].

O.O. Dyakonovanın fikirləri də diqqətəlayiqdir: "Multimedia interaktiv keyfiyyətlərinə görə son dərəcə faydalı təhsil texnologiyasıdır – istifadəçi sorğularını lazımi məlumatlarla təmin edir. Bu texnologiyalar parlaqlığına, ifadəliliyinə, vizual və eşitmə təsvirlərinin informasiya intensivliyinə görə təhsilin keyfiyyətinin yüksəldilməsi üçün səmərəli vasitədir. Üstəlik, didaktik prinsipdən - vizuallaşdırmadan istifadə edə bilərsiniz. Tədris imkanı tələbələrin əhatəsində həm fərdi, həm də kütləvi ola bilər [3, s. 15]

Müasir dövrdə xarici dillərin, o cümlədən ingilis dilinin öyrənilməsi özünün aktuallığı ilə diqqəti cəlb edir. İngilis dilinin lazımi səviyyədə öyrədilməsi təhsil mühiti şəraitinin dəyişməsi, ingilis dilinin tədrisində müasirləşmə proseslərinin, həmçinin bu dil nümayəndələrinin sosial-psixoloji xüsusiyyətlərinin nəzərə alınmasını tələbata çevirir.

Dövlətin təhsil siyasətinin başlıca vəzifəsi məktəblilərin, o cümlədən V-ƏX sinif şagirdlərinin təfəkkürünün, mənəviyyatının inkişafı və yüksək mədəni şəxsiyyət kimi yetişməsindən ötrü lazımi şərait yaratmaqdan ibarətdir.

Ümumtəhsil məktəblərində ingilis dili müəllimləri aşağıdakı multimediya vasitələrindən faydalanırlar: fotoaparatlar, proyektorlar, kinoproyektorlar, kinokameralar, səsin yazılması və bərpası üçün vasitələr (maqnitofonlar, elektrofonlar, CD pleyerlər), optik və proyeksiya plyonkaları və foto avadanlıqları (DVD-lər, televiziya və radio qəbulediciləri). pleyerlər), teleqraf, telefon və radio rabitə vasitələri (telefonlar, radiorabitə sistemləri), eyni zamanda məlumatların sənədləşdirilməsi və çoxaldılması məqsədilə işlədilən avadanlıqlar (kompüterlər, surətçıxarma maşınları, skanerlər, printerlər), interaktiv lövhələr və virtual obyektlər.

Multimedia tədris vasitələri təqdim olunan materialın əyaniləşdirilməsinə, şagirdlərdə təlimə məsuliyyətli münasibətin formalaşdırılmasına, onların marağının artırılmasına, şəxsi keyfiyyətlərin (özünütəhsil və özünütərbiyə); kommunikativ və sosial qabiliyyətlərin inkişaf etdirilməsinə kömək göstərir.

Pedaqoji ədəbiyyatda multimedia tədris vasitələrinə, adətən texniki vasitələri (internet, kompüter, mobil qurğular, multimedia proyektoru, interaktiv lövhə, audio və videoregistratorlar), həmçinin proqram təminatını, elektron tədris resurslarını (elektron dərsliklər, elektron təlim proqramları, ensiklopediyalar, stimulyatorlar) aid edirlər.

Texniki vasitələr hansı imkanlara malikdir? İngilis dili müəlliminin və şagirdlərin həmin imkanlardan məlumatları olmalıdır.

1. *Kompüter* – bu və ya digər şəxsin müdaxiləsi olmadan çoxsaylı arifmetik və məntiqi əməliyyatlar da daxil olmaqla əhəmiyyətli həcmdə hesablamaları yerinə yetirməyə imkanı olan bir cihazdır. Kompüter neçə onilliklərdir ki, bütün ölkələrdə insan həyatının hər bir sahəsində geniş istifadə edilir.

2. *İnteraktiv lövhə* - kompüter və proyektorun köməyilə bu və ya digər şəkli və məlumatı nümayiş etdirən ekran qurğu rolunu oynayır.

3. *Multimedia proyektoru* kompüterin köməyilə zəruri məlumatların şagirdlərə və ekrana proyeksiya edildiyi cihazdır.

Bu kimi proyektorundan faydalanmanın hansı müsbət cəhətləri vardır? Omları diqqət mərkəzinə gətirək:

1) canlandırılan təsvirin keyfiyyəti yaxşıdır (şəkillər parlaq və aydın olur, mətn asanlıqla oxunur);

2) proqram materialının aydlınlaşdırılması məktəblilər üçün əlverişlidir. Bir var izah tabaşirdən faydalanmaqla aparılsın, bir də var ki əyani olsun. Təbii ki, ikinci hal daha münasibdir.

3) çatışmayan nə isə meydana çıxdığı təqdirdə dərhal şagirdlərin gözləri qarşısında ekranda düzəlişlər aparılır;

4. *Mobil qurğular* şəxsi faydalanma məqsədi daşıyır. Onlar displey və miniatür klaviaturadan ibarət olan portativ cihazlardan ibarətdir. Mobil cihazlara Adətən planşetləri, mobil telefonları, ağıllı bilərzikləri, elektron oxucuları və musiqi pleyerlərini mobil qurğulara aid edirlər.

5. *Video və səs yazıcıları*. Bunlar vaxtilə daşıyıcıda yazılmış məlumatı təkrarən istehsal etməyə-i nəzərdə tutan texniki qurğulardır. Bu və ya digər tədris məlumatlarının çatdırılma vasitələrinin, xüsusən audio qurğulardan faydalanma təlim prosesində proqram materialını, audiokitablardan və audio seminarlardan çıxarışlara qulaq asmağa, yeni sözlərlə tanış olmağa, xarici nitqi qulaqdan qavramağa və natiqdən sonra təkrar etməyə şərait yaradır.

Məktəblilər audio materialların köməyilə yaddaş və diqqəti inkişaf etdirir, mətndəki başlıca məlumatları toplamağı və məzmunun zəruri məqamlarını yadda saxlamağı öyrənirlər.

*Proqram təminatı və Elektron Təhsil Resursları*: Proqram təminatı kompüter sisteminin çox əhəmiyyətli hissəsi hesab edilir.

İngilis dili müasir təhsil sistemində xüsusi yer tutur. Xarici dillərin tədrisi nəzəriyyəsi və metodologiyasının öz tarixi var, lakin dil tədrisi davam edən dəyişikliklərin təsiri ilə müasirləşməkdədir.

Təcrübəli müəllimlər şagirdlərin ingilis dilinə səmərəli yiyələnmələrini təmin etmək üçün yeni yollar və vasitələr axtarışında olurlar. Bu sahədə ən etibarlı vasitə multimedia texnologiyalarından istifadədir. Bu, şagirdlərin ingilis dili öyrənmək motivasiyasını gücləndirməyə, öyrənmənin fərdiyönlü olmasına, ryni zamanda kompüter texnologiyası bacarıqlarının inkişafına və ya təkmilləşdirilməsinə şərait yaradır.

Xarici dilin, o cümlədən ingilis dilinin öyrənilməsi zamanı şəxsiyyətin formalaşması prosesi gedir. Bu prosesi izləyək: “1) Düşünmək. Bu, xarici dil mədəniyyətinin öyrənilməsi zamanı sistemli şəkildə baş verir. Nəticədə şagirddə dünyanın mənzərəsi, dünyagörüşü və dəyərlər sistemi formalaşır. Bu, dünyaya tənqidi baxışa və yad mədəniyyətə vahid münasibətin formalaşmasına əsaslanan dərin işdir.

2) Təhsil. Bu, təfəkkürlə bağlı olan mürəkkəb prosesdir, lakin tolerantlıq, empatiya göstərmək bacarığı, başqa mədəniyyətə, dinə, davranış nümunələrinə və s. kimi şəxsiyyət keyfiyyətlərinin inkişafını nəzərdə tutur. Bütün bunlar dərin zəhmət tələb edir.

3) İnkişaf. Xarici dilin mənimsənilməsi zamanı şagirddə psixi proseslər və şəxsiyyət xüsusiyyətləri inkişaf edir: yaddaş, diqqət, təxəyyül, iradə. Bundan əlavə, ilkin təzahürlərindən asılı olmayaraq şagirdin linqvistik qabiliyyətləri inkişaf etdirir.

4) Ünsiyyət. Xarici dil bir fənn kimi tələbələrin ünsiyyət bacarıqlarının inkişafına yönəlib. Təcrübəyönlü bir mövzu olmaqla, vacib bir problemi həll edir - eyni zamanda ünsiyyəti öyrədir və ünsiyyət çərçivəsində mövcuddur.

çalışmaq çox çətindir. Orada müxtəlif yaş qrupları üzrə şagirdlər təhsil alır. Keçid dövründən sonra şagirdlərlə, xüsusən oğlan uşaqları ilə işləmək çox mürəkkəbdir». Məktəbdə psixoloji xidmət işinin səviyyəsi inkişafda olan prosesdir. ”Psixoloji xidmət işi müxtəlif istiqamətlərdə aparıldığından onların hər birinə özünəməxsus üsulla yanaşılır. Keyfiyyətli və səmərəli tətbiq edilmiş metod öz nəticələrinə görə seçilir” (5, s. 55).

Psixoloq şagirdlərin intellektual və şəxsi emosional inkişafının fərdi, psixoloji xüsusiyyətlərini öyrənir, siniflərdə və qruplarda sosial-psixoloji mühiti tədqiq edir. Uşaqların məktəbdə psixoloji cəhətdən hazırlığını araşdırmaqla onların yaş və inkişaf səviyyələrini müəyyən edir. O cümlədən, emosional pozuntuları olan, pis davranışlara meyl edən və istedadlı uşaqları üzə çıxararaq onlarla iş aparır. Günün aktual mövzularından biri də məktəbdə psixoloji xidmətin səviyyəsidir. Hər bir məktəbdə psixoloji xidmətin olması mütləqdir. Çünki, inkişaf dövrünün bəzi böhranlı mərhələləri var ki, bunlar məhz məktəb illərinə təsadüf edir. Məktəb psixoloqunu işi məktəbəqədər yaşlı uşağın məktəbə hazırlığını müəyyən etmə mərhələsindən başlayır. Odur ki, şagirdlərin qarşısına çıxan problemlərin məktəb psixoloqunun köməyilə düzgün diaqnostika və korreksiya edilməsinə böyük ehtiyac duyulur. Ancaq ölkənin orta təhsil ocaqlarında məktəb psixoloqunun yerinə yetirməli olduğu vəzifəyə o qədər də önəm verilmir. Halbuki, uşaqların təlim və tərbiyə prosesinə məktəb yaşlarından başlayaraq müəllimlər və valideynlərlə birgə, psixoloqlar da nəzarət etməlidir. ”Məktəbdə praktik psixoloqun işi elə qurulmalıdır ki, məktəb direktorları və müəllimlərlə bahəm, valideyn və şagirdlər də ona inansınlar, etibarla yanaşsınlar, ağıllı və təsirli məsləhətlərindən faydalansınlar. Praktik psixologiyanın praktik effektləri olmalıdır. Onun məktəbdə statusu ancaq bu effektlərlə müəyyən edilə bilər” (6, s.346).

**Problemin aktuallığı.** Psixoloqun şagirdlərlə iş aparan zaman ən çox problemlə qarşılaşdığı yaş dövrü - kiçik məktəbli yaş dövrüdür. Bu dövr 6-10 (I-IV sinif) yaşlarını əhatə edir və böhranlı dövr kimi yadda qalır. Uşağın məktəbə daxil olması onun həyat və fəaliyyətində ciddi dəyişikliklər əmələ gətirməklə bərabər, məktəblinin cəmiyyətdəki sosial mövqeyini, öz yaşıdları ilə bərabər yaşlılarla ünsiyyət formaları və qarşılıqlı münasibətlərinin də dəyişməsini tələb edir, beləliklə mövzunun aktuallığına diqqət çəkir.

**Problemin elmi yeniliyi.** Məqalədə ibtidai təhsildə şagirdlərə psixoloji xidmətin təşkilinin aktual istiqaməti, şagirdlərin təlim-tərbiyəsindəki bu və digər çətinlikləri, onların davranışlarında, ünsiyyətlərində, şəxsiyyətinin formalaşmasındakı qüsurlarla bağlı bugünkü problemlərin həlli istiqaməti araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** İbtidai təhsildə şagirdlərə psixoloji xidmətin təşkilinin təkmilləşməsində və yeni optimal variantların ortaya qoyulmasında istifadə edilə bilər.

**Ədəbiyyat**:

1. Əliyev, R.İ. http://aztehsil.com/psixoloq/203-thsild-psixoloji-xidmt-blmsi.html
2. kayzen.az/blog/pedaqoq/1769/psixoloji-xidmət-və-onun-təşkili.html
3. http://www.muallim.edu.az/www.old/arxiv/2015/05/04.htm
4. Qədirov, Ə.Ə. Yaş psixologiyası. -Bakı: Maarif, -2002, -386 s.
5. Çələbiyev, N.Z. Uşaq psixologiyası. -Bakı: 2005, -343s.
6. Əmrahlı, L.Ş, Psixoloji xidmətin əsasları. -Bakı:, 2008. -267s
7. Əlizadə, Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. -Bakı: Ozan, -1998, -367 s.

**E- mail:** y.askerova@inbox. ru
**Redaksiyaya daxil olub:** 24.06.2024

UOT159.9

***Səməngül Tacəddin qızı Abdullayeva***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Şamaxı filialının müəllimi*
*https://orcid.org/ 0000-0001-5089-4821*
https://doi.org/10.69682/arti.2024.91(4).149-152

# ERKƏN YAŞLI UŞAQLARDA OYUNLARIN KÖMƏYİ İLƏ HƏMYAŞIDLARI İLƏ ÜNSİYYƏTİN İNKİŞAF ETDİRİLMƏSİ

***Саменгуль Таджаддин гызы Абдуллаева***
*преподаватель Шамахинского филиала Азербайджанского Государственного Педагогического Университета*

# РАЗВИТИЕ ОБЩЕНИЯ СО СВЕРСТНИКАМИ С ПОМОЩЬЮ ИГР У ДЕТЕЙ РАННЕГО ВОЗРАСТА

***Samengul Tajaddin Abdullayeva***
*teacher at Shamakhi branch of Azerbaijan State Pedagogical University*

# DEVELOPMENT OF COMMUNICATION WITH PEERS WITH THE HELP OF GAMES IN EARLY AGE CHILDREN

**Xülasə.** Məqalədə erkən yaşlı uşaqların öz həmyaşıdları ilə ünsiyyətinin formalaşıb inkişaf etməsi məsələsinə toxunulur. Qeyd olunur ki, bunun üçün müxtəlif oyunlardan istifadə etmək olar: cütlərlə oyun, bir neçə həmyaşıdlarla oyun, əşyalardan istifadə edərək birgə oyun və s. Bundan başqa Azərbaycan milli oyunlarının elementlərini və xalq nağıllarını əks etdirən oyunlardan da yararlanmaq olar. Belə oyunların hər biri kiçik uşaqlar arasında qarşılıqlı müsbət münasibətin yaranıb inkişaf etməsinə töhfə verir.
***Açar sözlər:*** *ünsiyyət, həmyaşıd, əşya, fərdi*

**Аннотация.** В статье рассматриваются вопросы формирования и развития общения детей раннего возраста со сверстниками. Отмечается, что для этого могут использоваться различные игры: игры в парах, игры с несколькими сверстниками, совместные игры с использованием предметов и др. Кроме того, вы также сможете насладиться играми, отражающими элементы азербайджанских национальных игр и народных сказок. Каждая из этих игр способствует возникновению и развитию взаимоположительных отношений между детьми раннего возраста.
***Ключевые слова:*** *общение, сверстник, предмет, индивидуально*

**Abstract.** The article deals with the formation and development of early-age children's communication with their peers. It is noted that various games can be used for this: games with pairs, games with several peers, joint games using objects, etc. In addition, you can also enjoy the games that reflect the elements of Azerbaijani national games and folk tales. Each of these games contributes to the emergence and development of a mutually positive relationship between young children.

***Keywords:*** *communication, peer, item, individual*

Qeyd etməliyik ki, erkən yaşlı uşaqların tərbiyəsi bir qədər diqqət tələb edən məsələdir və burada uşaqların fərdi xüsusiyyətləri mütləq nəzərə alınmalıdır.

Erkən yaşlı uşaqların davranışlarına nəzər salanda belə bir nəticəyə gəlmək olur ki, onlarda öz həmyaşıdlarına maraq, qarşı tərəfini diqqətini öz hərəkətlərinə cəlb etmək, birlikdə hərəkət etmək, həmyaşıdının hərəkətlərini təqlid etmək

kimi xüsusiyyətlərlə yanaşı onlarda nəyi isə bölüşməyi, əlində olanı qarşı tərəfə verməyi istəməməsi kimi xüsusiyyətlər də özünü büruzə verir. Buradan belə nəticəyə gəlmək olur ki, uşaqların böyük əksəriyyətində öz həmyaşıdları ilə ünsiyyət səviyyəsi olduqca aşağı səviyyədədir. Birlikdə oynanılan oyunları təşkil edərkən tərbiyəçilər uşaq ünsiyyətinin inkişafının dörd mərhələsinə uyğun olaraq bu və ya digər birgə oyun növündən istifadə edə bilər:

Birinci mərhələdə uşağın öz həmyaşıdına subyekt münasibətinin formalaşması baş verir. Burada açar rol böyüklərə məxsusdur, məhz onlar uşağa digər uşağın da subyektliyini qeyd etməli, uşaqların oxşar bacarıqlara malik olduğunu, onunla oynamaq istədiyini qeyd etməlidir. Bu mərhələdə böyüklərin hər bir uşağa fərdi yanaşması əsasdır, ona görə də bu mərhələdə yalnız iki uşağın bir-biri ilə oyun oynamasını təşkil etmək daha məqsədəuyğundur ki , bu da böyüklərin bilavasitə iştirakı ilə baş tutmalıdır. Oyunun davamında daha bir neçə uşağı bura cəlb etmək olar.

İkinci mərhələdə erkən yaşlı uşaqlara xas olan emosional-praktik qarşılıqlı fəaliyyət inkişaf edir. Belə qarşılıqlı fəaliyyət zamanı uşaqlar bir-birinin hərəkətlərini təkrarlamağa meylli olurlar. Bu isə kömək edir ki, uşaq öz həmyaşıdı ilə bənzərlik və ümumi maraqlarının olmasını hiss edir. Emosional- praktik mərhələdə böyüklər oyunu başlatmalı, müsbət emosional atmosfer yaratmalı, düzgün davranış nümunəsi nümayiş etdirməlidir.

Üçüncü mərhələ uşağı bu və ya digər rolu qəbul etməyə, yaşıdları ilə bu və ya digər rol vasitəsilə ünsiyyət qurmağa hazırlamağa xidmət edir. Erkən yaşlı uşaqlar hələ müstəqil şəkildə öz üzərinə hər hansı bir rolu götürmək, bir-biri ilə qarşılıqlı fəaliyyəti nəzərdə tutan situasiya düşünüb tapmağı bacarmırlar. Buna baxmayaraq, onlar böyüklərin köməyi ilə təsəvvür olunan kontekstə daxil olub yeni məzmunlu situasiyaya qoşula bilirlər. Bu zaman çalışmaq lazımdır ki, sadə qaydaları olan oyunlara müraciət olunsun. Bütün bunlar uşağı məktəbəqədər yaş dövründə aparıcı rola malik olan süjetli- rollu oyuna hazırlayır.

Dördüncü mərhələdə uşaqların birgə əşyalı və məhsuldar fəaliyyəti inkişaf etməyə başlayır. Belə fəaliyyət uşağa oyun yoldaşının davranış və maraqlarına oriyentasiya olunmağa, onun hərəkət və fəaliyyətinin nəticələrinin nəticələrini nəzərə almağa istiqamətlənmiş olur. Ona görə də bu mərhələ uşaqların bir-birinin subyektliyini qəbul etdikdən sonra baş tuta bilir.

Erkən yaşlı uşaqların öz həmyaşıdları ilə ünsiyyətinin formalaşıb inkişaf etməsi üçün müxtəlif oyunlardan istifadə etmək olar: cütlərlə oyun, bir neçə həmyaşıdlarla oyun, əşyalardan istifadə edərək birgə oyun və s. Bundan başqa Azərbaycan milli oyunlarının elementlərini və xalq nağıllarını əks etdirən oyunlardan da yararlanmaq olar. Belə oyunların hər biri kiçik uşaqlar arasında qarşılıqlı müsbət münasibətin yaranıb inkişaf etməsinə töhfə verir.

Cütlərlə oyunlar həyatının ikinci ilində olan, eyni zamanda məktəbəqədər təhsil müəssisəsinə yeni daxil olmuş, hələ həmyaşıdları ilə ünsiyyət, birgə fəaliyyət təcrübəsi olmayan uşaqlar üçün xüsusilə vacibdir və öz həmyaşıdın qarşı müsbət emosional – subyekt münasibətin yaranmasına, ünsiyyət tələbatının formalaşmasına şərait yaradır. Cütlərlə oyunların məqsədi kimi uşağın diqqətinin öz həmyaşıdına yönəlməsini, eyni maraqlarının olması fikrinin formalaşdırılmasını başa düşmək olar. Bütün bunlar uşaqlar arasında subyekt-subyekt münasibətinin yaranması üçün olduqca vacibdir.

Uşaqlar arasındakı bu oyunlar bilavasitə qarşılıqlı fəaliyyətdə əşyalardan istifadə etmədən həyata keçirilir. Belə oyunlar zamanı uşaqlarda emosional komponent daha parlaq ifadə olunur, o, həmyaşıdının hərəkətlərini təqlid etməyə köklənir. Bu oyunların mərkəzində böyüklər dayanaraq balacaları özünün çıxardığı səsləri, yaxud da etdiyi hərəkətləri təkrar etməyə istiqamətləndirir. Uşaqların arasında olan böyüklər situasiyanın mərkəzinə çevrilir, sanki oyunun dirijoru kimi çıxış edən iştirakçıya çevrilir.

Uşaqların bilavasitə bir-birinə yaxın dayandığı, üzbəüz durduğu oyunlar baxışların kontaktına, fiziki kontakta və emosiyalarını paylaşmağa maksimum şərait yaradır. Belə oyunlar uşaqların bir-birinə və iştirak edən böyüklərə baxması, ola bilər ki, bir-birlərinə nəvazişlə toxunması ilə başlaya bilər. Oyun müddətində balacalar kiçik stullarda, xalça üzərində, yaxud da böyüklərin qucağında(dizləri üzərində) həmyaşıdları ilə üzbəüz əyləşə bilərlər. Başlanğıcda tərbiyəçi onların hər biri ilə ayrı-ayrılıqda oyunu

“oynayır”, daha sonra isə tədricən təşəbbüsü hissə-hissə uşaqlara ötürür. Məsələn, “Dovşan-dovşan” oynayan zaman tərbiyəçi əvvəlcə özü uşağın əllərinə barmaqları ilə toxunur, onun barmaqlarını bir-bir qatlayaraq şeiri oxuyur, sonra isə balacalara da belə etməyi və tərbiyəçi və həmyaşıdı ilə oyunu davam etdirməyi təklif edir. Uşaqların çətinlik çəkdiyi təqdirdə tərbiyəçi uşaqları kömək edir və şeirin ayrı-ayrı sözlərini, eləcə də bir hissəsini təkrarlamağa ruhlandırır. Bu tipli oyunları oynamağı nəinki hələ heç bir birgə oyun, ünsiyyət təcrübəsi olmayan erkən yaşlı uşaqlar, eləcə də yaşıdları ilə ünsiyyətqurma tələbatı artıq formalaşmış uşaqlar da xoşlayırlar.

Bir neçə uşağın birlikdə oynaması onlardan daha çox diqqətlilik, müstəqillik və qaydalara riayət edə bilmək bacarığı tələb edir. Oyunlar balacalara birgəlik hisslərini yaşamağa kömək edərək onlarda həmyaşıdlarından ibarət qrupla emosional-praktik qarşılıqlı əlaqə yaratmaq bacarığını tərbiyə edir. Birgə oyunlar uşaqlara yaxşı tanış olan sadə hərəkətlər üzərində qurulmalıdır. Belə oyunlar uşaqları digər uşaqların davranış və hərəkətlərini diqqətlə izləmək, onları təkrar etmək, tərbiyəçiyə və oyun yoldaşına qulaq asmaq, öz hərəkətlərini tərbiyəçinin və yaşıdlarının hərəkətlərinə uyğunlaşdırmaq bacarığına yiyələnməyə təşviq edir. Oyunun gedişində tərbiyəçi balacalara birlikdə hər hansı hərəkəti yerinə yetirməyi təklif edir(hoppanmaq, əllərin yuxarı qaldırmaq, əl çalmaq, fırlanmaq və s.), onları bir-birinin hərəkətlərini yamsılamağa sövq edir.

Getdikcə uşaqlara növbə ilə dairənin mərkəzində dayanıb müstəqil olaraq yeni hərəkətlər düşünüb tapmağı, digərlərinin də həmin hərəkətləri təkrar etməsini tapşırmaqla tərbiyəçi oyunları mürəkkəbləşdirə bilər. Balacalardan zəncirvari şəkildə hər hansı hərəkəti (yanındakı yoldaşını sığallamaq, qucaqlamaq, onu adı ilə çağırmaq və s.) bir-birinə ötürmək tapşırıla bilər.

Əgər uşaqlar oyuna başlamaq təşəbbüsünü üzərlərinə götürürlərsə, onları mütləq dəstəkləmək lazımdır. Bu zaman uşaqlara təşkil etdikləri oyunda hərəkət sərbəstliyi vermək lazımdır. Lakin, əksər hallarda uşaqlar ora-bura qaçmağa o qədər aludə olurlar ki, bir-birlərinə demək olar ki əhəmiyyət vermirlər. Tərbiyəçi belə halda balacaların çox da aludə olmasına şərait yaratmadan onlara yumşaq tonla daha sakit xarakterli məşğuliyyət təklif etməlidir.

Beləliklə də hərəki, emosional cəhətdən dolu olan oyunlarla xalça üzərində yaxud da stullarda əyləşərək rahat oynanıla bilən oyunlar arasında balansı qorumaq lazımdır. Belə oyunlara uşaqların barmaqları ilə yerinə yetirdikləri oyunları aid etmək olar ki, bu zaman uşaqlar bir-birlərini yamsılamaqda çətinlik çəkmirlər. Bu oyunları günün istənilən vaxtında hərəki oyunlarla növbələşdirərək təşkil etmək məsləhətdir. Bu tipli oyunlar balacaların xoşuna gəlir və onları sakitləşdirir, onlardan naharı və yaxud digər fəaliyyətləri gözləyərkən istifadə etmək olar. Birgə fəaliyyətin inkişafına xalq oyunlarının timsalında təkrarlanan sadə hərəkətlərin sözlərlə uyğunlaşdırılaraq xorla uşaq mahnılarının oxunması da təsir göstərir. Belə oyunlar iştirakçıların hərəkətlərinin və fiziki kontaktlarının sinxronluğuna istinad edir. Eyni anda dəfələrlə hərəkətlərin təkrarlanması uşaqları birləşdirərək onlarda hərəkətləri yamsılamaq tələbatını ödəmək rolu oynayır.

“Xor” oyunlarında balacaların öz hərəkətlərini oyun yoldaşının hərəkətləri ilə uyğunlaşdırmaq bacarığını inkişaf etdirməsi üçün maksimum şərait yaranır. Öz xarakterinə görə “xor” oyunları əyləncəli oyunlara bənzədiyi üçün bu oyunlarda uşaqlar arasında rəqabət hissi demək olar ki, tamamilə istisna olunur. “Xor” oyunları balacaları xalq poetik yaradıcılığı nümunələrinin də mənimsənilməsinə xidmət edir. Hərəkətlərin sözlərlə müşayiət olunması onların yerinə yetirilməsini asanlaşdırır, belə ki, uşaqlar bu yolla oyunun məzmununu dərk edərək anlayır. Bu tipli oyunlar uşaqların ünsiyyət təcrübəsini zənginləşdirir. Bir-biri ilə bu formada ünsiyyət quraraq onlar öz emosiyalarını ifadə etmək, hərəkətlərini nizamlamaq, həmyaşıdının vəziyyətini başa düşmək, hərəkət dili ilə “danışmaq” və s. kimi bacarıqları mənimsəyirlər.

Tərbiyəçi bu oyunlar vasitəsilə uşaqların rəğbətini, onların inamını qazanaraq şüurlu olaraq qaydalara riayət etmələrinə nail olur. Bu oyunlara bəstəkarların asan yadda qalan uşaq mahnılarını və şairlərin şeirlərini əlavə etmək olar.

Əşyalarla və oyuncaqlarla birgə oyunlar uşaqlar arasında ünsiyyətin inkişafına xidmət edən xüsusi qrupu təşkil edir. Əksər hallarda

erkən yaşlı uşaqlar əşyalarla oyunlara elə aludə olurlar ki, öz həmyaşıdlarına demək olar ki, heç əhəmiyyət vermirlər. Balacalar hələ bir-birləri ilə oynamağı bacarmır, oyuncaqlara görə dalaşır, onları bir-birinin əlindən alırlar. Lakin əşya və oyuncaqların uşaqların qarşılıqlı fəaliyyət göstərməsinə və birgə oynamaqlarına mane olması faktı bizə əsas vermir ki, onların ünsiyyət sferasından oyuncaqları tamamilə çıxaraq. Həmyaşıdların oyun fəaliyyəti zamanı əşyalarla oyun elementlərini əks etdirən situasiyalar qurmaq çox əhəmiyyətlidir.

Birgə oyun zamanı oyuncaqları gizlətmək, top-top oynamaq, piramidaları yığıb-dağıtmaq, sonra yenidən qurmaq, kubik, qum və konstruktor oyuncaqlardan müxtəlif tikintilər (evciklər, qatar, yollar, piramidalar və s.) qurmaq, kuklalar üçün muncuqlar düzəltmək, böyük vərəqlərdə müxtəlif rəsmlər çəkmək kimi fəaliyyətlərdən istifadə etmək olar. Əşyalarla oyunlar uşaqların marağını cəlb etsin deyə

Süjetli oyun təşkil etmək daha məqsədəuyğun olar. Əgər balacalar süjetli oyunların bəziləri ilə artıq tanışdırlarsa gəlinciklərlə və digər oyuncaqlarla birgə oyunu təşkil etmək olar. Balacaların həmyaşıdları ilə ünsiyyət qurmasına imkan verən xüsusi oyun və məşğələlər qrupun erkən yaşlı uşaqlarının həyatının ayrılmaz bir parçasına, onların vərdiş etdikləri, arzuladıqları və sevdikləri məşğələyə çevrilməlidir. Belə oyunları rejim saatlarının arasında, gəzinti zamanı, uşaqların sərbəst oyunları zamanı, bədən tərbiyəsi və musiqi məşğələlərində təşkil edib keçirmək olar. Erkən yaşlı uşaqların ünsiyyət qurması, oyun və məşğələlərə qoşulması bir çox hallarda problem yaratsa da, yuxarıda sadalanan üsul və vasitələrdən istifadə etməklə bu sahədə inkişafa nail olmaq mümkündür. Bir müddət keçdikdən sonra qrupda müsbət inkişaf tendensiyasını izləmək mümkün olacaqdır. Bu zaman həmyaşıdlar ilə ünsiyyət səviyyəsi yüksələcək, uşaqların bir çoxu diaqnostik parametr üzrə orta və yüksək səviyyə nümayiş etdirəcəklər. Nəticədə uşaqlar bir-biri ilə qarşılıqlı əlaqə, birlikdə hərəkət etmək və ünsiyyətə daha meylli olacaqlar.

**Problemin aktuallığı.** Müasir dövrdə uşaqlar məktəbəqədər təhsil müəssisəsinə məhz erkən yaşlarında daxil olur və həmin dövrdə onlarda hələ öz həmyaşıdları ilə ünsiyyət qurmaq bacarığı inkişaf etməmiş olur ki, bu da onların psixi inkişafında və inkişafında öz əksini tapır. Məqalədə biz belə bir fikir formalaşdırmağa çalışmışıq ki, birgə fəaliyyətin oyun formasından istifadə edilməsi erkən yaşlı uşaqların öz həmyaşıdları ilə ünsiyyət qurma imkanlarının səviyyəsinin yüksəlməsinə səbəb ola bilər. Ünsiyyətin məhsulu kimi uşaqda öz "mən" obrazı haqqında fikir, eyni zamanda ətraf aləmlə qarşılıqlı münasibət formalaşmış olur. Beləliklə, ünsiyyət insanın öz inkişafında istifadə etdiyi ilk fəaliyyət növüdür. Birgə fəaliyyət forması kimi ünsiyyət insanın cəmiyyətdə inkişafının vacib və özünəməxsus şərti kimi çıxış edir.

**Problemin yeniliyi.** Müasir dövrün tələblərinə uyğun olaraq uşaqların tərbiyə mövzusu daim yenilənir. Köhnə nəzəriyyələrin günümüzdə tətbiqi bəzən praktikada effektiv nəticə göstərməyə bilər. Səbəbi isə çox sadədir – inkişaf etmiş cəmiyyət. Məsələn, keçən əsrin 80-90-cı illərinin tərbiyə metodu ilə XXI əsrin tərbiyə metodu arasında fərqlər mövcuddur. Bu məqalədə erkən yaşlı uşaqların həmyaşıdları ilə ünsiyyət quraraq təlimə qoşulması məsələsini nəzərdən keçirmişik .Burada açar rol böyüklərə məxsusdur, məhz onlar uşağa digər uşağın da subyektliyini qeyd etməli, uşaqların oxşar bacarıqlara malik olduğunu, onunla oynamaq istədiyini qeyd etməlidir. Bu mərhələdə böyüklərin hər bir uşağa fərdi yanaşması əsasdır, ona görə də bu mərhələdə yalnız iki uşağın bir-biri ilə oyun oynamasını təşkil etmək daha məqsədəuyğundur ki, bu da böyüklərin bilavasitə iştirakı ilə baş tutmalıdır.

Bir müddət keçdikdən sonra qrupda müsbət inkişaf tendensiyasını izləmək mümkün olacaqdır. Bu zaman həmyaşıdlar ilə ünsiyyət səviyyəsi yüksələcək, uşaqların bir çoxu diaqnostik parametr üzrə orta və yüksək səviyyə nümayiş etdirəcəklər. Nəticədə uşaqlar bir-biri ilə qarşılıqlı əlaqə, birlikdə hərəkət etmək və ünsiyyətə daha meylli olacaqlar.

**Ədəbiyyat:**


1. Həsənova, P. Məktəbəqədər təhsildə pedaqoji ünsiyyət və onun müasir problemləri // – Bakı: Məktəbəqədər və ibtidai təhsil, – 2022. № 2, – s. 48-56.
2. Quliyev, B.S. Azərbaycan milli uşaq oyunları: Monoqrafiya. / B.S. Quliyev Bakı: Xəzər Universiteti,-2016.-144 s.
3. Həsənov, A. M. Məktəbəqədər pedaqogika. / A.M. Həsənov. Bakı, 2015.

**E-mail:** semengul.abdullayeva@gmail.com
**Redaksiyaya daxil olub:**29.05.2024

*UOT 159.9*

***Səriyyə Əkbər qızı İsazadə***
*Bakı Dövlət Universitetinin*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*ORCİD 0009-0007-1144-233X*
https://doi.org/10.69682/arti.2024.91(4).153-156

# VALİDEYN HİMAYƏSİNDƏN MƏHRUM OLMUŞ KİÇİKYAŞLI MƏKTƏBLİLƏRDƏ EMOSİONAL-İRADİ SFERANIN FORMALAŞMASININ PSİXOLOJİ-PEDAQOJİ ŞƏRTLƏRİ

***Сария Акбар гызы Исазаде***
*докторант по программе доктора философии*
*Бакинского Государственного Университета*

# ПСИХОЛОГО-ПЕДАГОГИЧЕСКИЕ УСЛОВИЯ ФОРМИРОВАНИЯ ЭМОЦИОНАЛЬНО-ВОЛЕВОЙ СФЕРЫ У МЛАДШИХ ШКОЛЬНИКОВ, ЛИШЕННЫХ РОДИТЕЛЬСКОЙ ОПЕКИ

***Sariyya Akbar Isazade***
*doctorial student in the program of doctor of philosophy*
*of Baku State* University

# PSYCHOLOGICAL AND PEDAGOGICAL CONDITIONS FOR THE FORMATION OF THE EMOTIONAL-VOLITIONAL SPHERE IN JUNIOR SCHOOLCHILDREN DEPRIVED OF PARENTAL PROTECTION

**Xülasə.** Elmi məqalədə valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məkətblilərdə emosional-iradi sferanın formalaşmasının psixoloji-pedaqoji şərtləri ardıcıllıqla psixoloji aspektdə araşdırılmışdır. Məqalədə qeyd edilir ki, valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblinin emosional-iradi sferasının formalaşması bir tərəfdən uşağın emosional dəstəyə və rahatlığa ehtiyacı olduğu zaman mürəkkəb münasibətlər sistemidir. Digər tərəfdən qaydalara və normalara riayət etmək tələbi uşağın davranış seçimini məhdudlaşdırır.
***Açar sözlər:*** *kiçik yaşlı məktəblilər, emosional-iradi sfera, emosional dəstək, psixoloji-pedaqoji şərtlər, emosional inkişaf*

**Аннотация.** В научной статье в психологическом аспекте последовательно исследованы психолого-педагогические условия формирования эмоционально-волевой сферы у младших школьников. В статье утверждается, что формирование эмоционально-волевой сферы школьника младшего возраста, лишенного родительской опеки, представляет собой сложную систему взаимоотношений, когда, с одной стороны, ребенок нуждается в эмоциональной поддержке и комфорте, а с другой стороны, требование следовать правилам и нормам ограничивает выбор поведения ребенка.
***Ключевые слова:*** *младший школьник, эмоционально-волевая сфера, эмоциональная поддержка, психолого-педагогические условия, эмоциональное развитие*

**Abstract.** The scientific article examines psychological assistance, especially in the psychological aspect, in the logical and pedagogical aspect of the formation of the emotional-volitional sphere in younger schoolchildren. The article argues that the formation of the emotional-volitional sphere of a primary school

student thanks to supervision is a complex system of relationships when, on the one hand, the child needs emotional support and comfort. On the other hand, the requirement to follow rules and norms limits the choice of behavior.

***Keywords:*** *junior schoolchild, emotional-volitional sphere, emotional support, psychological and pedagogical conditions, emotional development*

Psixoloji-pedaqoji ədəbiyyatda emosiyaları insanın həyat fəaliyyəti üçün xarici və daxili vəziyyətlərin qiymətləndirilməsini və şəxsi əhəmiyyətini əks etdirən proseslər kimi fərqləndirirlər. Hisslər və emosiyalar insanın özünə və ətraf aləmə subyektiv münasibətini əks etdirməyə xidmət edir. V.Q. Krisko ümumi fiziki, əmək, intellektual, əxlaqi və estetik ilə yanaşı emosional inkişafı da fərqləndirir. Alimin fikrincə, "uşağın emosional inkişafı onun ətrafdakı reallıq hadisələrinə həssas və düzgün cavab vermək bacarığında, kortəbii emosional impulsları və reaksiyaları, psixi vəziyyətləri düzgün idarə etmək bacarığında ifadə olunur" [2].

M.İ. Enikeyev emosiyaları mühüm xarici təsirlər əsasında fərdin həyatı üçün faydalı və ya zərərli olmasının duyğusal əks olunmasına əsaslanan davranışın impulsiv tənzimlənməsinin psixi prosesi kimi təyin edir [1,s.61]. Fikrimizcə, kiçik yaşlı məktəblilər üçün ən xarakterik hal davranışın impulsiv tənzimlənməsidir. Yaşayış şəraitinin çoxobrazlılığı emosionallığın müxtəlif aspektlərini inkişaf etdirir.

Emosional həyatın müxtəlif təzahürləri insanın keçirdiyi affektlərdə, şəxsi emosiyalarda, hisslərdə, əhval-ruhiyyədə, frustrasiya və stressdə təzahür edir. Ən güclü emosional reaksiya insan psixikasını tamamilə ələ keçirən və bütövlükdə vəziyyətə vahid reaksiyanı əvvəlcədən təyin edən şiddətli, güclü və nisbətən qısamüddətli emosional hal olan affektdir.

Kiçik məktəb yaşı dövründə hisslər çox vaxt davranış motivinə çevrilən iradi hərəkətlərdə mühüm rol oynayır. Bu yaş mərhələsində iradə və hisslərin inkişafı daimi qarşılıqlı əlaqədə baş verir. Bəzi hallarda hisslər iradənin inkişafına kömək edir, digərlərində isə maneə yaradır. Hisslər insanın mədəni-emosional inkişafının ən yüksək məhsuludur. Onlar müəyyən mədəniyyət sahəsinə daxil olan obyektlər, fəaliyyət növləri və insanlarla sıx əlaqəlidirlər.

Hisslər aydın şəkildə müəyyən edilmiş obyektiv xarakter daşıyan sabit psixi vəziyyətlərdir, onlar bəzi obyektlərə (real və ya xəyali) sabit münasibət bildirirlər. İnsanlar hisslər olmadan yaşaya bilməzlər, onlar kiməsə və ya nəyəsə öz hisslərini bildirməyə çalışırlar. İstiqa-mətindən asılı olaraq hisslər əxlaqi (insanın başqa insanlarla münasibət təcrübəsi), intellektual (idrak fəaliyyəti ilə əlaqəli hisslər), estetik (sənəti, təbiət hadisələrini dərk edərkən gözəllik hissləri), praktiki (insanlarla əlaqəli hisslər) hisslər kimi xarakterizə olunurlar. Hisslər çox davamlı və uzunmüddətli ola bilər.

Valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblinin emosional-iradi sferasının formalaşması bir tərəfdən uşağın emosional dəstəyə və rahatlığa ehtiyacı olduğu zaman mürəkkəb münasibətlər sistemidir. Digər tərəfdən qaydalara və normalara riayət etmək tələbi uşağın davranış seçimini məhdudlaşdırır. Bizim vəziyyətimizdə tərbiyə metodu "tərbiyə olunan tərbiyənin subyektidir" ilkin mövqeyinə əsaslanır. Buna görə də, valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblilərin emosional-iradi sferasının formalaşdırılması vəzifəsi sosial mühitin, müəllimlərin və ətrafdakı insanların şagirdin emosional sferasına göstərdiyi müsbət təsirləri təşkil etmək və bunun fonunda onlara müsbət münasibət formalaşdırmaqdır.

Yaşlıların vəzifəsi valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblinin müsbət modellərə uyğunluğunu formalaşdırmaq deyil, həm də ona mənfi hadisələrə qarşı durmağı öyrətməkdir. Həmçinin, tədqiqatımızda nəzərə alırıq ki, kiçik yaşlı məktəblilərin normativ davranışı üçün motivasiya birbaşa formalaşmır, o konkret situasiya motivlərinin yaradılmasını, uşağın onun üçün əhəmiyyətli olan birgə fəaliyyətə cəlb edilməsini tələb edir.

Beləliklə, biz valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblinin emosional-iradi sferasının formalaşması prosesini uşağın mühüm ehtiyaclarını nəzərə alaraq onu fəaliyyətə cəlb etməklə emosional vəziyyətini sabitləşdirən və onun iradi keyfiyyətlərinin formalaşması yolu ilə davranış normaları və qaydaları haqqında biliklərin mənimsənilməsi, onların

şəxsi münasibətlərə daxil edilməsi, həmçinin norma və qaydalara riayət etmək üçün obyektiv ehtiyacın inkişafına istiqamətləndirilmiş məqsədyönlü tərbiyəvi təsir kimi müəyyən edirik.

A.M. Proxojana görə, emosional-iradi sferanın formalaşması sosial şəraitdən asılıdır. Bu baxımdan hesab edirik ki, uşağın emosional vəziyyətinin sabitləşməsi və iradi keyfiyyətlərin formalaşması valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblilər üçün müxtəlif fəaliyyət növlərinə və normativ davranış formalarına daxil edilən optimal pedaqoji şəraitin yaradılmasını tələb edir [3].

Elmi pedaqoji-psixoloji ədəbiyyatın nəzəri təhlili əsasında valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblinin emosional-iradi sferasının formalaşması üçün aşağıdakı psixoloji-pedaqoji şərtləri müəyyən etdik:

* ***Birinci şərt*** - valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblinin həm fərdi xüsusiyyətlərini və imkanlarını, həm də onun əvvəlki inkişaf vəziyyətini nəzərə almağa yönəlmiş təhsil prosesinin subyektləri arasında münasibətlərin humanistləşdirilməsidir. Kiçik yaşlı məktəbli oxuduqlarını kifayət qədər dərk etmədikdə və ya böyüklərlə ünsiyyətdə inkişaf etməkdən praktiki olaraq məhrum olduqda xüsusilə bu çox vacibdir. Müasir məktəbin təhsil prosesində humanistləşdirmə prinsipinin həyata keçirilməsi problemi M.V. Çumakovun elmi tədqiqatlarında araşdırılmışdır [4].

****İkinci şərt*** valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblilərin yaxın inkişaf zonalarının və aktual tələbatlarını, imkanlarını nəzərə alaraq fəaliyyətin təşkilidir. *Aktual inkişaf zonası* əvvəlki inkişafın nəticəsi, yəni uşağın müstəqil olaraq əldə etdiyi nəticələrdir. *Yaxın inkişaf zonası* perspektiv kimi gələcək üçün xarakterikdir, uşağın hazırkı təcrübəsi və yaşı üçün daha mürəkkəb olan fəaliyyətlərdə böyüklərin köməyi ilə əldə etdiyi nəticələrdir.

Qeyd etdiyimiz ***üçüncü şərt*** valideyn himayəsindən məhrum olmuş uşaqlara şəxsi-sosial yanaşmadır. Şəxsi-sosial konsepsiyanın müəllifi L.İ. Qrisenko vurğulayır ki, "hər bir insanın özünəməxsusluğunu dərk etməsi yalnız digər insanlarla müqayisədə mümkündür. Amma bu şəxsi özünüdərk prosesinin sərbəst və uğurlu olması üçün o, kortəbii ünsiyyətdə deyil, icmada baş verməlidir və effektiv təhsil xüsusi bir cəmiyyət növündə - kollektivdə həyata keçirilir" [42, s.4].

****Dördüncü şərt*** başqa bir insanın problemlərinə, təcrübələrinə, onun mənəvi dünyasına maraqla xarakterizə olunan dialoq ün-siyyətidir. Dialoq valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəbli ilə yaşlıların dialoq vəziyyətlərinin birgə müzakirəsini əhatə edir. Belə bir müzakirə yalnız uşağın şəxsiyyətinə və onun rəyinin əhəmiyyətinə hörmət mühitində, böyüklərin sosial rollarının arxa plana keçdiyi və daha çox nəzərdə tutulduğu zaman mümkün olur.

Dialoq zamanı kiçik yaşlı məktəblilər vəziyyəti başa düşmədən diqqətlə dinləmək, başqalarının sözünü kəsməmək və qəti şəkildə mühakimə etməmək bacarığını öyrənirlər. Uşaqlarda davranış və hərəkətlərinin nəticələrini qabaqcadan görmək qabiliyyətinin inkişafı xüsusilə vacibdir.

****Beşinci şərt*** kimi valideyn himayəsindən məhrum olmuş uşağın gərginliyini azaltmağa və psixi təzyiqləri aradan qaldırmağa sövq edən psixoloji rahatlıq mühitinin yaradılmasını hesab edirik. Bu mühit xüsusilə valideyn himayəsindən məhrum olmuş uşaqlar üçün çox vacibdir. Qorxu, yüksək səviyyədə narahatlıq, qeyri-müəyyənlik və inamsızlıq psixoloji stressin səbəbləridir. Müsbət emosional vəziyyət emosional səviyyədə tərbiyəvi təsirləri qəbul etmək üçün əsas təşkil edir.

Kiçik məktəb yaş dövrü uşaq şəxsiyyətinin, xüsusən də emosional və iradi sferanın inkişafında mühüm mərhələdir. Doğulanda uşaq yalnız emosional cəhətdən yetkin, güclü iradəli bir insan olmaq üçün imkanlara malikdir. Uşaq bu keyfiyyətləri böyüklərin təşkil etdiyi tərbiyə prosesində əldə edir. Tədris prosesi isə elə qurulmalıdır ki, biliklərin, inancların və əməli hərəkətlərin üzvi vəhdətini təmin etsin.

Valideyn himayəsindən məhrum olmuş uşaqların uşaq evlərində və himayədar ailə şəraitində aşağıdakı məntiqi əlaqələr ardıcıl olaraq həyata keçirilməlidir:

*problemli vəziyyətə cavab olaraq davranış qaydaları, onun təzahürləri haqqında məlumatlara diqqət yetirmək;

* arzu olunan davranış nümunələri və metodlarını təyin etmək;

* qaydanın, standartın, nümunənin həyata keçirilməsinə emosional müsbət münasibətin

ortaya çıxması, arzu olunan davranışa yiyələnmək üçün daxili motivasiya;

* öz hərəkətlərini planlaşdırmağı öyrətmək, öyrənilən qaydalara, standartlara uyğun davranışı təşkil etmək, göstərişlər vermək və onların yerinə yetirilməsini yoxlamaq, müvəffəqiyyəti gücləndirmək;

* müvafiq motivasiya olduqda arzu olunan hərəkətlərdə sistemli məşqlər təşkil etmək. Nəticədə sabit məna yaradan motivasiyaya və vərdiş halına gələn arzu olunan davranış tərzinin xarakter xüsusiyyətinə keçid baş verir.

Yuxarıda göstərilənlərin hamısına əsaslanaraq valideyn himayəsindən məhrum olmuş uşaqların uşaq evlərində və himayədar ailədə olan şəraitdə uşaqların emosional-iradi sferasının formalaşmasına töhfə verən pedaqoji tələblərə aşağıdakılar daxil edirik:

- Uşağın mənfi emosiyalarını aradan qaldırmağa çalışdığı bütün hallarda onu həvəsləndirmək;

- Uşaqlara oyun texnikalarının öyrətmək;

- Uşağın qrup oyunlarına, eyni tapşırıqları alan və uğurları üçün yarışan 3-4 uşaqdan ibarət komandalara daxil etmək, bu zaman impulsiv uşağa baş rol təyin etmək məsləhətdir.

- Uşağın dramatik, tanış süjetli oyunlara cəlb etmək;

- Xüsusi nümunələrdən istifadə edərək uşağa hərəkətlər və təcrübələr arasındakı fərqi göstərmək və s.

Beləliklə, məlum oldu ki, valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblilərin uşaq evlərində və himayədar ailə şəraitində emosional-iradi sferasının formalaşması emosional vəziyyətin sabitləşməsi, motivasiyasının formalaşması və birgə fəaliyyətdə iradi keyfiyyətlərin inkişafına qədər mərhələlərlə baş verir.

Tədqiqatın nəzəri və praktiki nəticələrinə əsasən kiçik yaşlı məktəblilərin uşaq evlərində və himayədar ailə şəraitində olduqları şəraitdə emosional-iradi sferanın formalaşması sisteminin təkmilləşdirilməsi üçün tövsiyələr işlənib hazırlanmış və praktikada tətbiq edilmişdir.

**Problemin aktuallığı.** Valideyn himayəsindən məhrum olmuş uşaqların uşaq evlərində və himayədar ailə şəraitində uşaqların emosional-iradi sferası mərhələlərlə inkişaf etdirilməsinə, uşaqlarda motivasiyanın yaranmasına tələbat vardır.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə valideyn himayəsindən məhrum olmuş kiçik yaşlı məktəblilərdə emosional-iradi sferanın formalaşmasının psixoloji-pedaqoji şərtləri ardıcıllıqla psixoloji aspektdə araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Еникеев, М.И. Общая и юридическая психология [Текст] / М.И. Еникеев. - СПб.: Питер, - 2006. - 320 с.
2. Крысько, В.Г. Психология и педагогика: Схемы и комментарии [Текст] / В.Г. Крысько. - М.: Изд-во ВЛАДОС ПРЕСС, -2001. - 368 с.
3. Прихожан, А.М. Исследование психического развития младших школьников, воспитывающихся в закрытом детском учреждении [Текст] / А.М. Прихожан, Н.П. Толстых // Психология развития. - СПб: Питер, -2001. С. 144-154.
4. Чумаков М.В. Эмоциональные аспекты волевой регуляции: Монография. - Курган, 2005.


**E-mail:** seris.isazade@gmail.com
**Redaksiyaya daxil olub:** 24.06.2024

UOT 159.9

***Sevinc Raqub qızı Səmədova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*fəlsəfə doktoru proqramı üzrə doktorantı*
*https://orcid.org/0000-0002-0687-6412*
https://doi.org/10.69682/arti.2024.91(4).157-160

# NEYROELM TƏDQİQATLARININ KİÇİKYAŞLI MƏKTƏBLİNİN TƏLİM MÜHİTİNƏ TƏTBİQİ VƏ ÖYRƏNMƏNİN DAVAMLILIĞININ ARTIRILMASI

***Севиндж Рагуб гызы Самедова***
*докторант по программе доктора философии*
*Института Образования Азербайджанской Республики*

# ПРИМЕНЕНИЕ НЕЙРОНАУЧНЫХ ИССЛЕДОВАНИЙ В СРЕДЕ ОБУЧЕНИЯ ШКОЛЬНИКОВ МЛАДШЕГО ВОЗРАСТА И ПОВЫШЕНИЕ НЕПРЕРЫВНОСТИ ОБУЧЕНИЯ

***Sevinj Ragub Samadova***
*doctorial student in the program of doctor of philosophy of the*
*Institute of Education of the Republic of Azerbaijan*

# APPLYING NEUROSCIENTIFIC RESEARCH TO THE ENVIRONMENT OF YOUNGER SCHOOLCHILDREN AND ENHANCING CONTINUITY OF LEARNING

**Xülasə.** Uzun illər boyu öyrənmə və beyin arasındakı əlaqəni əhatə edən mürəkkəblik və qeyri-müəyyənlik diqqəti cəlb edib. Baxmayaraq ki, neyroelm bu sahəni başa düşməyimizin əsasını təşkil edir, lakin onun tapıntılarını hələ birbaşa təhsil sisteminə tətbiq etmək mümkün deyil. Buna baxmayaraq, neyroelm tədqiqatlarını ehtiyatla təlim prosesinə uyğunlaşdırmaqla maneələri aradan qaldırmaq, onun müəmmalarını yavaş-yavaş açmaq mümkündür. Bu sahədə aparılan tədqiqatlar öyrənmənin səmərəliliyini və nəticələrini artırmaq üçün yeni imkanlar açacaqdır. Həmçinin neyroelm tədqiqatlarının tədrisə daxil edilməsi inqilabi inkişafa imkan verəcəkdir.
***Açar sözlər:*** *neyroelm, kiçikyaşlı məktəbli, təlim mühiti, öyrənmənin effektivliyi, öyrənmə və onun davamlılığı.*

**Аннотация.** В течение многих лет привлекала внимание сложность и неопределенность, окружающая взаимосвязь между обучением и мозгом. Хотя нейронаука занимает центральное место в нашем понимании этой области, ее результаты пока не могут быть применены непосредственно к системе образования. Тем не менее, тщательно адаптируя нейробиологические исследования к процессу обучения, можно преодолеть препятствия и постепенно разгадать его тайны. Исследования в этой области откроют новые возможности для повышения эффективности и результатов обучения. Кроме того, включение нейробиологических исследований в преподавание позволит осуществить революционный прогресс.
***Ключевые слова:*** *нейронаука, школьник младшего возраста, среда обучения, эффективность обучения, обучение и его устойчивость.*

**Abstract.** For many years, the complexity and uncertainty surrounding the relationship between learning and the brain has attracted attention. Although neuroscience is central to our understanding of this field, its findings cannot yet be applied directly to the education system. Nevertheless, by carefully adapting neuroscientific research to the learning process, it is possible to overcome obstacles and slowly unravel its mysteries. Research in this area will open up new opportunities to improve learning effectiveness and outcomes. Also, the inclusion of neuroscience research in teaching will allow revolutionary development.

***Keywords:*** *neuroscience, younger schoolchild, learning environment, effectiveness of learning, learning and its sustainability.*

Təlim prosesində kiçikyaşlı məktəblinin öyrənmə davamlılığını neyroelmin yeni müddəalarından istifadə etməklə xeyli təkmilləşdirmək olar. Bu, həm də şagirdlərin unikal keyfiyyətlərini təlim mühitinə uyğunlaşdırmaq yolu ilə effektiv öyrənmə strategiyalarının hazırlanmasını əhatə edir.

Bu gün tədqiqatçılar, pedaqoqlar və ekspertlər fənlərarası yanaşmaların kəsişmə nöqtəsindədirlər. İnsan beynindən, tədris və incə-sənətin kompleks tətbiqlərindən istifadə etməyə çalışırlar, çünki təhsil müxtəlif öyrənmə üslublarını həll etməyə, fərdi ehtiyacları ödəməyə və intellektual inkişafı gücləndirməyə çalışır. Neyroelmin inteqrasiyası təkcə nəyin öyrədilməli olduğu deyil, həm də onu necə öyrətmək barədə seysmik yenidən düşünməyə və öyrənmə proseslərinin əsasını təşkil edən mürəkkəb sinir mexanizmlərini izləyən pedaqoji inkişaflardan uzaqlaşmağa gətirib çıxarır. Onlar həmçinin təklif edirlər ki, nevroelmin təhsil sahəsinə tətbiqi tədris üsullarını və təhsil nəticələrini yaxşı mənada təkmilləşdirə bilər. Beynimizin necə işlədiyini və şagirdlərin biliyi necə əldə etdiyini başa düşmək müəllimlərə öz tədris təcrübələrini hər bir tələbənin unikal tələblərinə uyğunlaşdırmağa imkan verir. Bu yolla daha səmərəli tədris üsulları yaratmaq onların təlim nəticələrinin daha da yüksəlməsinə səbəb olacaq. Bu uğurlu strategiya öyrənənlərə qavrama maneələrini dəf etməyə kömək edə biləcək strategiyaları formalaşdırmaq üçün beynin uyğunlaşma qabiliyyətinin dərk edilməsinə əsaslanır. Bundan əlavə, neyroelmin təhsil sahəsinə qarışdırılması müəllimlərə şagirdlərin üzləşdiyi öyrənmə problemlərinin əsas səbəblərini müəyyən etmək və həll etmək üçün faydalıtəqdim edə bilər. İnkişaf pozğunluqları və emosional hallar kimi prob-lemlərin aradan qalxmasına kömək ola bilər. Eyni zamanda şagirdlərin beyin imkanlarını tam şəkildə cəlb edən öyrənmə strategiyalarını inkişaf etdirmə işində müəllimlərin qarşılaşdıqları çətinliklərin aradan qaldırılması yollarını ayird etməkdir [4].

Bu sahədə böyük irəliləyişlərə baxmayaraq hələ də neyroelmi təhsil elmləri və onun praktik tətbiqləri ilə ayıran uçurum mövcuddur. Əsl problem beyindəki öyrənmə prosesləri haqqında bildiklərimizi təhsil sahəsində çalışanlara aid olan praktik biliyə çevirməkdir. Bununla belə, bu sahədə mühüm irəliləyişlər əldə edilmişdir. İndi neyronların doğumdan əvvəl və sonra necə inkişaf etdiyi və körpələrin görmə, eşitmə, nitq, yerimək və ya hərəkət etmək kimi həyati bacarıqları necə mənimsədiyinə dair daha aydın təsəvvürümüz var. Maraqlıdır ki, uşaqlar sosial anlayışla yanaşı əxlaqi hissləri də mənimsəyir və böyümə yetkinlik dövründə dayanmır, əksinə davam edir. Burada biz təkcə bioloji böyümədən bəhs etmirik, həm də fərdin şəxsiyyətinin böyüməsini də əhatə edirik. İki sahə arasında əlaqə prosesinin addımlara təməllərə əməl edilməlidir. Təhsil təcrübəsinin son məqsədi şagirdlərin təhsil prosesində iştirak edən bütün şəxslər üçün uzunmüddətli, keyfiyyətli öyrənmə əldə etmələrini təmin etməkdir. Buna görə də nəzərə alınmalı olan ən vacib elementlər kəmiyyət davranışı ilə əlaqəli olanlardır. Onları hər bir şagird qrupu və ya hər bir yaş mərhələsi üçün ümumi xüsusiyyətlər kimi başa düşmək və müəyyən etməklə, tədqiqatçılar əvvəlcədən müəyyən edilmiş davranış xüsusiyyətlərinə uyğun olaraq neyronların fəaliyyətini sinifdə öyrənmə ilə dəqiq əlaqələndirə bilərlər. Bu, kurikulumlara əsaslanan fərqli tədris metodları və strategiyaları hazırlamaq üçün istifadə edilə bilər ki, bu da şagirdin müsbət davranışını stimullaşdıra bilər.

Neyroelm tədqiqatlarında böyük irəliləyişlər həqiqətən heyranedicidir və beyin öyrənmə biliklərini müəllimlərin effektiv şəkildə istifadə edə biləcəyi resurslara köçürmək hələ də əhəmiyyətli sınaqlar yaradır. Bu məhdudiyyətlərdən asılı olmayaraq, beynimizin mürəkkəb labirintləri daxilində öyrənmənin necə baş verdiyini hərtərəfli başa düşmək böyük potensiala malikdir. Bu, bizi anadangəlmə bioloji meyillərimizə uyğun olaraq tədris metodologiyası yaratmağa istiqamətləndirə bilər [2].

Neyroelmin yeni müddəaları göstərir ki, eyni vaxtda birdən çox hissin stimullaşdırılmasının yadda saxlanmasını tələb edən məlumat daha uzun müddət şagirdin yaddaşında sabit qalır. Buna görə də təlim mühiti hər bir şagird

qrupunun fərdi öyrənmə ehtiyaclarına uyğun şəkildə məzmunu öyrətməklə müxtəlif stimulların (vizual, eşitmə və kinestetik) inteqrasiyasını təmin etmək üçün tərtib edilməlidir [5].

Neyroelmə əsaslanan öyrənmə strategiyalarının uğurla həyata keçirilməsinə dair bəzi nümunələr hansılardır? Daha yüksək səviyyəli düşünmə və daha dərin öyrənmənin təşviqində şagird mərkəzli təlimatın effektivliyini anlamaq üçün təhsildə nevrologiya tədqiqatlarından istifadə edilmişdir [6]. Məqsəd beynin məlumatı necə emal etdiyini daha yaxşı başa düşməkdir. və öyrənir. Tədqiqatlar göstərir ki, neyroelmi metodların tədqiqat və tədrisə tətbiqi beyin funksiyasında iki istiqamətli təzahürlərə səbəb ola bilər [8]. Təcrübədə neyroelmi prinsiplərin təhsildə tətbiqi tələbələrin öyrənilməsini dəstəkləmək üçün yeni nəzəri tədris strategiyaları işləyib hazırladı, lakin tədqiqatlar da göstərdi ki, sinifdə tətbiqetmə və tədqiqat nəticələri arasında uçurum var. Buna baxmayaraq, nevrologiyanın daha yaxşı tədris strategiyalarına səbəb ola biləcəyinə inam müəllimlərin tədris və öyrənməni təkmilləşdirmək üçün öz kurslarında istifadə edə biləcəkləri nevrologiya prinsiplərinin həyata keçirilməsinə təkan verdi [3]. Neyroelmdən öyrənmə metodu kimi istifadə edilən təlimat strategiyalarının təsirlərini araşdırmaq üçün eksperimental tədqiqatlar da aparılmışdır [7]. Ümumilikdə, nevrologiyaya əsaslanan öyrənmə strategiyalarının istifadəsi daha yaxşı təhsil nəticələrinə gətirib çıxara bilər, lakin tədqiqat nəticələri ilə sinif təcrübəsi arasındakı boşluğun qarşısını almaq və diqqətlə idarə etmək vacibdir. Öyrənmə zamanı beynin iş mexanizmini, konkret olaraq onun bilik kimi saxlamaq üçün şagirdin aldığı məlumatı necə emal etdiyini izah etmək. Buna görə də, kurikulumları tərtib edərkən, yaş mərhələsindən və məzmundan asılı olaraq ən yaxşı intervalda təkrarlama strategiyaları və axtarış təcrübələri haqqında aydın təsəvvür yaratmaq qabiliyyətinə görə yaddaşın konsolidasiyası ilə bağlı tədqiqatlara müraciət etmək məqsədəuyğundur. Beyin təsviri üsulları fərdi öyrənmə üslublarını və şagirdlərin koqnitiv güclü və zəif tərəflərini müəyyən etməyə kömək edir, beləliklə, hər bir şagirdin unikal ehtiyaclarına cavab verən daha çevik və fərdiləşdirilə bilən təhsil kurikulumlarını tərtib etməyə imkan verir və onların tədrisinin keyfiyyətinin və səmərəliliyinin artırılmasına yol açır. təlim nəticələri. Təhsil nevrologiyası tədqiqatları məzmundan və öyrənənlərdən asılı olaraq ən effektiv tədris metodunun necə seçiləcəyini göstərir. Məsələn, vizual stimullara əsaslanan təhsil metodlarına və mediaya beynin reaksiyası ilə bağlı tədqiqatlar təhsil fəaliyyətlərini istifadə etmək üçün daha çox üstünlük təşkil edə bilər.

Neyroelm tədqiqatlarının təhsil sistemlərinə tətbiqi ilə öyrənmə yanaşmalarında və kurrikulumun planlaşdırılmasında əhəmiyyətli dəyişiklik gözləyirik. Proses çətin vəziyyətlər və məhdudiyyətlər payı ilə bəzədilsə də, ondan əldə edə biləcəyimiz potensial üstünlüklərin təsirli dərinliyini və genişliyini inkar etmək olmaz. Dərin öyrənmə, kompüter görmə kimi sahələrdə nəzərəçarpacaq irəliləyiş neyron səviyyəsində baş verənlər və faktiki təhsil metodları arasında nöqtələri birləşdirməyə kömək edə biləcək yeni ümid, təravətləndirici yeni alətlər təklif edir.

Neyroelm tədqiqatlarının təhsil sahəsinə birləşməsi ciddi potensiala malikdir. Bu, ənənəvi öyrənmə üsullarının necə başa düşüldüyünü tamamilə dəyişə bilər. Əgər nevrologiyadan əldə edilən fikirlər təhsil metodlarının icrası ilə zərif şəkildə qarşılıqlı əlaqədə olarsa, onda bizim qarşımızda tamamilə yeni bir dünya açılır; öyrənmə üçün optimallaşdırılmış yollar və əsaslı dəlillərə əsaslanan kurikulumlar indi bizim üzərimizdədir. Təhsil insanlara texnologiyaları çevik mənimsəmək, əmək bazarında layiqli yer tutmaq və ömür boyu təhsil prosesinə qoşulmaq, sağlam həyat tərzi, ətraf mühitə münasibətdə düzgün mövqe seçmək imkanı verir [1]. Bu yolun öyrənilmiş gələcəyimizə apara biləcəyi yerə nəzər saldığınız zaman həyəcanlı səslənir.

**Problemin aktuallığı.** Kiçikyaşlı məktəb-lilərin öyrənməsinin davamlılığının artırılmasında müəllimlərin qarşısına çıxan çətinliklərin aradan qaldırılması üçün müxtəlif üsul və yolların araşdırılması, onlardan istifadə edərək yaxşılaşdırılması üçün neyroelm tədqiqatlarının təlim mühitinə tətbiqi məsələsi mühüm əhəmiyyəti kəsb edir

**Problemin elmi yeniliyi.** Məqalədə neyroelmin yeni tədqiqat sahəsi olması göstərilir və onun nəticələrini müxtəlif təhsil proseslərinə tətbiq etməklə tədris prosesinin effektivliyini və səmərəliliyini artırmağa kömək etməyin mümkünlüyü göstərilmişdir.

**Proqramın praktik əhəmiyyəti və tətbiqi.** Kiçikyaşlı məktəblinin öyrənmə davamlılığını artır-

maq üçün müəllim ilk növbədə onun öyrənmə üslubuna bələd olmalı, təhsil uöurlarına nail olmaq üçün müəllim, şagird və valideyn üçbucağı ilə birgə fəaliyyət göstərməlidir. Aparılan tədqiqatın nəticələrindən nəinki pedaqoqlar, həmçinin məktəb psixoloqları, gənc tədqiqatçılar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının təhsilin inkişafı üzrə Dövlət Strategiyası // - Bakı: Kurikulum, - 2013, №4, -s.2-5.
2. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu // - Bakı, -2018. 12 iyun.
3. Dubinsky, J. M., Roehrig, G., & Varma, S. (2022). A place for neuroscience in teacher knowledge and education. *Mind, Brain, and Education, 16*(4), 267–276. https://doi.org/10.1111/mbe.12334
4. Evgenia Gkintoni, Ioannis Dimakos. (2022). An Overview of cognitive neuroscience in education. 14th International Conference on Education and New Learning Technologies. doi:DOI:10.21125/edulearn.2022.1343
5. García, M., Sgro, M., Stharinger, R., & Gargiulo, P. (2016). Efecto de las técnicas de gimnasia cerebral en la atención y concentración sostenidas en el proceso inicial de alfabetización [Effect of brain gymnastics techniques on sustained attention and concentration in the initial literacy process]. Acta Psiquiátrica y Psicológica de América Latina, 62(3), 148-152. https://psycnet.apa.org/record/2016-51776-001
6. Johnson, E. L., and Knight, R. T. 2015. Intracranial recordings and human memory. Curr. Opin. Neurobiol. 31:18–25. doi: 10.1016/j.conb.2014.07.021
7. Romero Parra, R. M., Barboza Arenas, L. A., Espina-Romero, L. C., Rodríguez Ángeles, C. H., Romero Chacin, J. L., Garcés Rosendo., E. J., Faría Romero, J. A., & Vertiz Osores, R. I. (2023).
8. Ruiz, C. (2017). Neurociencia y educación [Neuroscience and Education]. Paradigma, 14(1y2), 90-108. https://bit.ly/3sIBCrU



**E-mail:**sevinc.samedova.1988@mail.ru



**Redaksiyaya daxil olub:** 24.06.2024

